"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev

"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"




Heydər Əliyev 100

# ƏSRƏ BƏRABƏR 20 İL

## Rektor Cəfər Cəfərov: Azərbaycan növbəti onillikdə inkişafının yeni mərhələsinə keçərək bütün hədəflərini reallığa çevirəcək

Hər bir xalqın taleyində elə zamanlar var ki, bu dövrlərdə xalq uzun mübarizədən, gərgin və mürəkkəb tarixi inkişaf yolundan keçərək yeni inkişaf mərhələsinə, tərəqqi və rifah səviyyəsinə qədəm qoyur. Belə dövrləri xalqın qızıl dövrü də adlandırırlar. Bu inkişaf səviyyəsinə çatmaq, onu dayanıqlı əsaslarla gələcək nəsillərə ötürmək isə heç də asan deyil. Bunun üçün xalqın əzmkarlığı, çalışqanlığı ilə yanaşı, güclü iradəyə, uzaqgörən siyasi təfəkkürə malik lideri olmalıdır.

Bunun ən bariz nümunəsi Ümummilli Lider Heydər Əliyevdir. 100 illik yubileyini böyük fərəhlə qeyd etdiyimiz Ulu Öndər təkcə müasir müstəqil Azərbaycanın memarı və xilaskarı deyil, həm də Azərbaycana özündən sonra layiqli Lider yetişdirmiş dühadır.

Bu fikirləri AZƏRTAC-a açıqlamasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, tarix elmləri doktoru professor Cəfər Cəfərov bildirib. Rektor qeyd edib ki, bu gün Ulu Öndər ideyalarını ən mükəmməl səviyyədə davam və inkişaf etdirən Prezident İlham Əliyev ölkəsinin və vətəndaşlarının rifahını təmin etməyi ali məqsəd kimi qarşısına qoyan əsl Liderdir. Bu baxımdan Azərbaycan xalqı olduqca şanslıdır. Prezident İlham Əliyevin Azərbaycana rəhbərlik etdiyi 20 il müddətində ölkəmiz bütün sahələrdə dinamik inkişaf mərhələsinə qədəm qoydu, iqtisadi inkişaf, ordu quruculuğu, elm və təhsilin inkişafı, Azərbaycan mədəniyyətinin dünya miqyasında təbliğ olunması, əhalinin sosial rifahının yüksəldilməsi, infrastrukturun yenilənməsi və genişləndirilməsi ilə bağlı meqalayihələr, dövlət proqramları icra olundu. Qarşıya qoyulmuş ən böyük məqsəd və vəzifə yerinə yetirildi – ərazi bütövlüyümüz və suverenliyimiz təmin olundu.

2020-ci ildə Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə Azərbaycan Ordusu tərəfindən 44 gün ərzində Qarabağı və Şərqi Zəngəzuru erməni işğalından azad edildi, bu il sentyabrın 19-20-də keçirilən lokal xarakterli antiterror tədbirləri nəticəsində isə Qarabağdakı separatçı rejim özünü buraxmağa məcbur edildi. Azərbaycan öz yenilməz Lideri, qüdrətli ordusu və dəmir yumruq kimi bir nöqtəyə vuran xalqı ilə son 100 il ərzində ona qarşı edilən qəsdlərin, məkrli planların nəticələrini tam aradan qaldıran qalib dövlət kimi dünya siyasi və hərbi arenasında möhtəşəm tarix yazdı. İlk dəfə Prezident seçildiyi tarixin 20-ci ildönümündə – 2023-cü ilin 15 oktyabrında Prezident İlham Əliyevin Xocalı, Xocavənd, Xankəndi və Ağdərə şəhərlərində, Əsgəran qəsəbəsində və Sərsəng su anbarının ərazisində Dövlət Bayrağını ucaltması, Xankəndi şəhərinin mərkəzindən Azərbaycan xalqına müraciət edərək 20 il əvvəl verilən bütün vədlərin yerinə yetirildiyini bildirməsi isə bu möhtəşəm tarixi zaman kəsiyinin ən parlaq səhifəsi, yeni və daha parlaq səhifələrin başlanğıcı idi. Bütün sahələrdə olduğu kimi, Prezident İlham Əliyevin Azərbaycana rəhbərlik etdiyi son 20 il ərzində ölkəmizdə elmin və təhsilin inkişafında da əsaslı irəliləyişlər olub. Bu gün Azərbaycan təhsili dünya təhsil sisteminin bir parçası kimi dinamik inkişaf edən, günbəgün maddi-texniki və elmi potensialı yüksəldilən, dövlətin tam qayğısı ilə əhatə olunan, dünya trendlərini tətbiq edən, eyni zamanda, milli-vətənpərvər ruhlu sağlam gənclər yetişdirən bir üzvi orqanizmdir. Son iyirmi ildə Azərbaycanda ali məktəblərin və ali təhsil alan tələbələrin sayı daha da artıb. Ali təhsil müəssisələrinə tələbə qəbulu planı ötən illə müqayisədə təxminən 48 mindən 55 minə qədər artırılıb. Yaxın bir neçə il ərzində isə illik tələbə qəbulu planı 75 min nəfərə çatdırılacaq. C.Cəfərov qeyd edib ki, müəllimlik ixtisaslarına ayrılan plan yerləri də artan dinamika üzrə inkişaf edir. Ölkədə müəllimlik peşəsinin nüfuzunun artırılması istiqamətində kompleks tədbirlər həyata keçirilir. Bütün bunların nəticəsidir ki, son illərdə pedaqoji ixtisasları, həmçinin Pedaqoji Universiteti seçən abituriyentlər arasında 600 baldan yüksək bal toplayan tələbələr kifayət qədərdir. Ümumilikdə isə son 10 ildə ali məktəblərə ixtisas seçimi edərkən müəllimlik ixtisaslarını seçənlərin sayı 18 min nəfərdən 50-55 min nəfərə qədər artıb. Azərbaycanda son 20 ildə ali təhsil sisteminin beynəlxalq rəqabətə dayanıqlılığının artırılmasına xüsusi fikir verilib, ölkəmizdə dünya standartları səviyyəsində fəaliyyət göstərən milli elmi-tədqiqat və təhsil müəssisələri yaradılıb. ADA Universiteti, Bakı Ali Neft Məktəbi və M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin Bakı filialı, Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin Bakı filialı, Azərbaycan-Fransız Universiteti, İtaliya-Azərbaycan Universiteti kimi birgə universitetlərin yaradılması bunlara misal ola bilər. "Biz qara qızılı insan kapitalına çevirəcəyik", – deyən müdrik Liderin apardığı uğurlu təhsil siyasəti nəticəsində bu gün ölkəmizdə ali təhsil hər kəs üçün əlçatandır. Ali məktəblərdə tələbələrin yarıdan çoxu dövlət hesabına oxuyur və təqaüd alırlar. Orta hesabla hər il tələbə təqaüdləri 20 faiz artırılır, tələbələrin sosial və məişət şəraitinin yaxşılaşdırılması və ictimai fəaliyyətlərinin dəstəklənməsi üçün işlək mexanizmlər qurulur. "Prezident İlham Əliyevin təhsil quruculuğu siyasətinin digər bir vacib elementi isə azərbaycanlı gənclərin dünyanın ən nüfuzlu xarici universitetlərində təhsil almağa göndərilməsidir. Bununla bağlı indiyədək icra olunmuş "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı" nəticəsində 5 min nəfərdən artıq azərbaycanlı gənc dünyanın aparıcı universitetlərində təhsil alıb. Prezidentin 2021-ci il 30 sentyabr tarixli Sərəncamına əsasən "Gənclərin xarici ölkələrin nüfuzlu ali təhsil müəssisələrində təhsil almalarına dair 2022-2026-cı illər üçün Dövlət Proqramı" təsdiq olunub. Eyni zamanda, "2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı"nın icrası çərçivəsində azərbaycanlı gənclərin xaricə getmədən keyfiyyətli təhsil almaq imkanlarının təmin edilməsi məqsədilə ABŞ-ın Corc Vaşinqton Universiteti (CVU) ilə ADPU və ADA Universiteti, Koreya Respublikasının İnha Universiteti ilə Bakı Mühəndislik Universiteti, Türkiyə Respublikasının Ege Universiteti ilə Azərbaycan Dövlət Aqrar Universiteti arasında beynəlxalq ikili diplom proqramları imzalanıb. ADPU ilə CVU arasında 3 ildir ki, uğurla icra olunan ikili diplom proqramı çərçivəsində ümumilikdə 130-a qədər gəncin təhsil siyasəti və idarəçiliyi sahəsində beynəlxalq səviyyəli mütəxəssis kimi yetişdirilməsi gözlənilir. Bütün bu deyilənlər böyük bir inkişaf marafonunun yalnız bir qanadına aid bəzi göstəricilərdir. Prezident İlham Əliyevin lideri olduğu bu marafonun növbəti xətti isə "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" əsasında "qüdrətli dövlət və yüksək rifah cəmiyyəti" hədəfini reallaşdırmaqdır. Biz əminik ki, Azərbaycan növbəti onillikdə inkişafının yeni mərhələsinə keçərək bütün hədəflərini reallığa çevirəcək", – deyə rektor Cəfər Cəfərov fikrini yekunlaşdırıb.

*"AZƏRTAC"*




**ADPU-nun prorektoru:**
**Prezident İlham Əliyev və Azərbaycan məktəbinin intibah dövrü**




**ADPU-nun prorektoru:**
**İyirmi il ərzində icra olunan dövlət proqramları təhsil sistemində yüksək nəticələrin qazanılmasına xidmət edir**




**ADPU-nun professoru:**
**Prezident İlham Əliyevin 20 illik fəaliyyəti xalqa sədaqətlə xidmət etmək nümunəsidir**




*1921-ci ildən təhsilimizin keşiyində . . .*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Oktyabr-Noyabr 2023 / № 6 (1124)

## Professor Abdulla Sofiyevlə görüş keçirilib

Dünyada mexanika və aerokosmik mühəndislik sahəsində tanınan alim, İstanbul Ticarət Universitetinin professoru Abdulla Sofiyev (Avey) Azərbaycan Diaspor Komitəsinin dəvətiylə Bakıda olub. Tanınmış alim oktyabrın 2-6-da Bakıda keçiriləcən Beynəlxalq Astronavtika Konqresində iştirak edib. Uzun illər xaricdə yaşayan, elmi nailiyyətləri ilə seçilən A.Sofiyev səfər müddətində bir sıra ali məktəblərdə professor-müəllim heyəti və tələbələrlə görüşüb.

İlk görüş A.Sofiyevin 1976-1980-ci illərdə təhsil aldığı Pedaqoji Universitetdə keçirilib. Tədbiri giriş sözü ilə açan ADPU-nun elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov Abdulla Sofiyevin həyatı, elmi fəaliyyəti barədə ətraflı məlumat verib.

102 illik elm və təhsil məbədi olan Pedaqoji Universitetin məşhur məzunları akademik Yusif Məmmədəliyev, akademik Zahid Xəlil və digər şəxsiyyətlərin adını vurğulayan prof. A.Zamanov A.Sofiyevin də ADPU-nun məşhur məzunları sırasında olduğunu qeyd edərək alimin yüksək elmi potensialının tək Türkiyədə deyil, dünyada etiraf olunduğunu deyib. A.Sofiyevin müəllimi olmuş prof. Məlikməmməd Cəbrayılov yaddaşında qalan xatirələri dilə gətirib, dünyada tanınan alimin müəllimi olduğu ilə fəxr etdiyini qeyd edib. ADPU-nun Riyazi analiz kafedrasının müdiri prof. Bəhram Əliyev A.Sofiyevin ölkədən xaricdəki uğurlu fəaliyyətindən söhbət açıb və bu baxımdan keçirilən tədbirin əhəmiyyətini vurğulayıb.

A.Sofiyevin alim həmkarı prof. Yusif Həsənov da mexanika və aerokosmik mühəndislik sahəsində alimin gördüyü işlərdən, nüfuzlu elmi dərgilərdəki əsərləri və ona olan istinadlardan danışıb.



Alimin yaxın qohumu olan Əməkdar jurnalist, "Şərq" qəzetinin baş redaktoru Akif Aşırlı da onun ölkə xaricində uğurlu elmi fəaliyyətindən, uşaqlıq, gənclik illərindən söz açaraq, A.Aveyin onlar üçün örnək olduğunu vurğulayıb.

Sonda prof. A.Sofiyev auditoriya qarşısında "Riyaziyyatdan mexanikaya gedən yol: problemlər və perspektivlər" mövzusunda geniş təqdimatla çıxış edərək elm yolunda uğurlu çalışmaların özünəməxsus formulunu cızıb.

Qeyd edək ki, prof. A.Sofiyev (Avey) "Beynəlxalq mexanika" jurnalının redaksiya heyətinin üzvüdür. 13 magistr və 5 elmlər doktoru yetişdirib. 300-dən artıq fundamental elmi məqaləsi mühəndislik, nanomaterial, kompozitlər, tətbiqi riyaziyyat və fizika sahəsinə aid nüfuzlu jurnallarında çap olunub. Məqalələrinin 165-i çox mötəbər beynəlxalq Elmi Sitat İndeksi (SCI) bazasına daxil olan jurnallarında işıq üzü görüb. Türkiyənin bir çox universitetlərinin və Almaniyanın Karlsruhe Universitetinin Texniki Mexanika İnstitutunun elmi layihələrində iştirak edən A.Sofiyev TUBİTAK və NATO dəstəkli layihələrdə uğurla iştirak edib.

## ADPU əməkdaşları SPSS sertifikatları ilə təltif olunublar



Oktyabrın 2-də ADPU-da Rəqəmsal İnkişaf və Nəqliyyat Nazirliyinin təşəbbüsü ilə 2021-ci ildən İnnovasiya və Rəqəmsal İnkişaf Agentliyinin həyata keçirdiyi "Technest" təqaüd proqramı çərçivəsində Agentliyin partnyor şirkətlərindən olan "Techspace Azərbaijan" MMC tərəfindən ADPU-nun əməkdaşları üçün keçirilən SPSS (Sosial Elmlər üçün Statistika Paketi - Statistical Package for Social Seciences) proqramı üzrə üç aylıq təlim kursunun bağlanışı və təltifetmə mərasimi keçirilib. Təlimlərdə ADPU-nun 15 nəfər gənc əməkdaşı iştirak edərək, yüksək nəticə ilə kursu tamamlayıb və müvafiq sertifikata layiq görülüblər.

Təltifetmə mərasimində Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, "Techspace Azerbaijan" MMC-nin direktoru Elçin Qasımov və şirkətin təhsil direktoru Mətanət Məmmədova iştirak edib.

Rektor Cəfər Cəfərov qeyd edib ki, ADPU-da akademik heyətin rəqəmsal bacarıqlarının inkişafına xüsusi önəm verilir və bu baxımdan universitet əməkdaşlarının "Technest" təqaüd proqramı çərçivəsində akademik tədqiqatlar üçün əhəmiyyətli SPSS proqramı üzrə təlimlərdə iştirakı xüsusi əhəmiyyətə malikdir.

Qeyd edək ki, SPSS proqramı dünyada statistik təhlil üçün, xüsusən də ictimai elmlər bölməsində geniş istifadə olunur. SPSS bazar tədqiqatçıları, sağlamlıq tədqiqatçıları, sorğu şirkətləri, dövlət qurumları, təhsil tədqiqatçıları, marketinq agentlikləri, "məlumat mədənçiləri" və s. tərəfindən praktik olaraq istifadə olunan, elmi-tədqiqat institutları, akademik təşkilatlar, bizneslər və dövlət müəssisələri üçün nəzərdə tutulan, beynəlxalq səviyyədə tanınan statistika və data analitikası proqramıdır. Təşkilatlar məlumatları anlamaq, meyilləri təhlil etmək, fərziyyələri yoxlamaq və dəqiq nəticələr əldə etmək üçün proqnozlaşdırma və planlaşdırma üçün SPSS statistikasından istifadə edirlər.

"Technest" təqaüd proqramı 2021-ci ilin oktyabr ayından Rəqəmsal İnkişaf və Nəqliyyat Nazirliyinin təşəbbüsü ilə İnnovasiya və Rəqəmsal İnkişaf Agentliyi tərəfindən həyata keçirilir. Məqsəd ölkədə İKT sahəsində kadr bankının yaradılması prosesinə töhfə vermək və əmək bazarındakı kadr ehtiyaclarını qarşılamaqdır. "Technest" təqaüd proqramı mütəxəssislərin hazırlanması məqsədilə İKT sahəsində ölkənin qabaqcıl tədris mərkəzləri ilə əməkdaşlıq çərçivəsində ən tələbatlı ixtisaslar üzrə İKT kurslarına müsabiqə yolu ilə tələbə qəbulunu təşkil edir.

## "EduSimbioz" layihəsinin bağlanış mərasimi keçirilib



Oktyabrın 3-də ADPU-da Elm və Təhsil Nazirliyinin elan etdiyi Təhsildə İnkişaf və İnnovasiyalar üzrə VI qrant müsabiqəsi çərçivəsində "EduSimbioz - Təhsil üçün öyrən və öyrət" layihəsinin bağlanış mərasimi keçirilib. Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyi, Bakı Şəhəri üzrə Təhsil İdarəsi və ADPU-nun Strateji İnkişaf Mərkəzinin birgə əməkdaşlığı ilə həyata keçirilən layihənin məqsədi Bakı üzrə təlim nəticələri aşağı olan məktəblərdə öyrənmə çətinliyi olan IX sinif şagirdlərinə pedaqoji-psixoloji dəstək göstərməkdir. Əvvəlcə, Azərbaycan Respublikasının Dövlət Himni ifa olunub, şəhidlərimizin ölməz xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov diqqətə çatdırıb ki, layihə çərçivəsində Universitetin "Riyaziyyat və informatika müəllimliyi", "Riyaziyyat müəllimliyi", "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisaslarında təhsil alan tələbələrinin ümumtəhsil məktəblərində mentor olaraq fəaliyyət göstərmələri olduqca qürurvericidir.

Rektor vurğulayıb ki, layihədə iştirak edən ADPU tələbələri üçün bu layihə pedaqoji sahədə təcrübə, öyrənmə çətinliyi olan şagirdlərlə işləmək, yeni təlim metodları ilə dərsin təşkil olunması kimi məqamlarla yanaşı, tələbələrin pedaqoji təcrübə imkanlarının genişləndirilməsi, real sinif şəraitində təcrübə qazanmaq baxımından da əhəmiyyət kəsb edir.

"Covid-19 pandemiyasından sonra şagirdlərdə yaranmış öyrənmə boşluğunun səbəblərini araşdırmaq, zəif nəticələrin aradan qaldırılması üzrə işin metodikasını təkmilləşdirmək təhsil sahəsində günümüzün əsas tələbatına çevrilmişdir. Həmçinin, bir-birindən fərqli bilik və bacarıq səviyyələrində olan şagirdlərə, müxtəlif icmalara dəstək göstərə bilmək bacarığı müasir müəllimdə görmək istədiyimiz xüsusiyyətlərdəndir və layihənin yaratdığı imkanlar tələbələr tərəfindən bu xüsusiyyət və bacarıqların qazanılması baxımından olduqca əlverişlidir. Pedaqoji Universitet və ümumtəhsil məktəbləri arasındakı qarşılıqlı əlaqənin müsbət nəticələri, universitet-məktəb əməkdaşlığının ümdə məsələ kimi diqqətdə saxlanılması gələcəyin pedaqoji kadrlarını hazırlayan ali təhsil müəssisəsi olaraq bizi sevindirir". - deyə prof. C.Cəfərov qeyd edib. Sonra ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva layihənin gedişatı ilə bağlı təqdimatla çıxış edib. Qeyd olunub ki, layihə çərçivəsində ADPU-nun 50 nəfər tələbəsi 4 ay ərzində, əsasən Qaradağ rayonunda olmaqla, Bakı şəhərinin müxtəlif yerlərində yerləşən 13 məktəbdə 500 nəfərə qədər şagird üçün hər biri həftədə 2 saat olmaqla Azərbaycan dili və riyaziyyat fənləri üzrə əlavə dərslər keçib, eyni zamanda şagirdlər və valideynlərlə psixoloji xidmətə dair seminarlar təşkil ediblər.

Prorektor qeyd edib ki, BŞTİ tərəfindən aparılmış monitorinqlərin nəticələri göstərir ki, mentor proqramı həyata keçirilən məktəblərdə IX siniflər üzrə təlim nəticələrində və buraxılış imtahanlarının nəticələrində müsbət dinamika qeydə alınmışdır.

Çıxış edən Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdiri Mehriban Vəliyeva və Elm və Təhsil Nazirliyinin Tədqiqat və İnnovasiyalar sektorunun müdiri Vüsalə Əliyeva bu kimi layihələrdən həm tələbələr, həm şagirdlərin faydalandığını diqqətə çatdıraraq qeyd ediblər ki, belə layihələr eyni zamanda yeni yanaşmaların tətbiqində, məktəb-universitet əlaqələrinin dərinləşməsində müsbət model rolunu oynaya bilər.

Daha sonra layihədə iştirak edən mentor tələbələrdən "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisasının III tədris ilinin tələbələri Şəlalə Qocayeva və Validə Şıxıyeva öz təəssüratlarını bölüşüblər

Qeyd olunub ki, layihənin davamlılığının təmin olunması məqsədi ilə proqramda iştirak edən tələbələrin oxşar layihələrə cəlb edilməsi, mövcud təcrübənin təbliği və genişləndirilməsi nəzərdə tutulur. Sonda layihə iştirakçılarına sertifikatlar təqdim olunub.

## Beynəlxalq Müəllimlər Günü qeyd olundu: Müəllim ömrü



Oktyabrın 3-də Kimya və biologiya fakültəsinin təşkilatçılığı ilə 5 Oktyabr - Beynəlxalq Müəllimlər Günü münasibəti ilə "Müəllim ömrü" adlı tədbir keçirilib.

Tədbirdə Univeristet rəhbərliyi, professor-müəllim və tələbə heyəti ilə yanaşı elmi ictimaiyyətin nümayəndələri də iştirak edib. Fakültənin dekanı, dosent Reyhan Ağayeva giriş sözü ilə çıxış edərək müəllimlərin cəmiyyətin əsas hərəkətverici qüvvəsi olduğunu və respublikamızda müəllimə ən ali dəyərin verildiyini diqqətə çatdırıb. Tədbirdə çıxış edən Elm və Təhsil Nazirliyinin Akademik Yusif Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutunun direktoru, akademik Vaqif Abbasov qeyd etdi ki, müəllim təkcə bilik öyrətmir, bəzən qayğıkeş ana, yolgöstərən ata, sirlərimizi bölüşəcəyimiz yaxın dostumuz olur: "Müəllimlərimiz - bizə cəhalətin qaranlığında mayak olan, həyatın enişli-yoxuşlu, bəzən fırtınalı yollarında əlimizdən tutandır. Onlar bizim parlaq sabahımızın təməlidir." 44 günlük Vətən müharibəsində canlarından keçən qəhrəman müəllimlərin əziz xatirələrinin anılmasından sonra tədbir "müəllim andı" ilə sona çatdı.

## Qocaman müəllimlərlə görüş keçirilib

Oktyabrın 5-də 5 Oktyabr - Beynəlxalq Müəllimlər Günü münasibəti ilə Universitetdə uzun müddət səmərəli elmi-pedaqoji fəaliyyət göstərən və hazırda təqaüddə olan qocaman müəllimlərlə görüş keçirilib.

Universitetin İnsan resursları şöbəsi və Həmkarlar İttifaqı Komitəsinin (HİK) təşkilatçılığı ilə baş tutan görüşdə rektor, professor Cəfər Cəfərov, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, İnsan resursları şöbəsinin müdiri Qumral Qədimova və HİK-nın sədri, dosent Vaqif Əliyev iştirak edib.



Çay süfrəsi ətrafında səmimi söhbət şəraitində keçən görüşdə çıxış edən rektor, prof. Cəfər Cəfərov qeyd edib ki, bir əsrdən artıq tarixə malik olan Pedaqoji Universitet bu günlərə məhz fədakar müəllimlərin sayəsində yetişib və vaxtilə ADPU ailəsinin üzvü olan, universitetin inkişafına töhfələr verən hər bir müəllimimiz bizim üçün olduqca dəyərlidirlər.

Qeyd olunub ki, universitet özünün "Ənənələrə sadiq, yeniliklərə açıq" şüarına uyğun olaraq, aparılan sürətli yenilənməylə yanaşı, daim qocaman alimləri diqqət mərkəzində saxlayır, onlarla mütəmadi görüşlər təşkil olunur, müxtəlif tədbirlərə dəvət olunurlar.

Öz növbələrində müəllimlər də ADPU-da çalışdıqları uzun illər haqqında təəssüratlarını bölüşərək, Pedaqoji Universitetin hər zaman onlara doğma bir ocaq olduğunu vurğulayıb, universitetlə daimi əlaqə saxladıqlarını qeyd ediblər. Sonda ADPU rəhbərliyi adından universitetdə uzun müddət səmərəli elmi-pedaqoji fəaliyyətlərinə görə qocaman müəllimlərə təşəkkürnamələr və hədiyyələr təqdim olunub.

## Fəlsəfə və Sosiologiya İnstitutu ilə əməkdaşlıq memorandumu imzalanıb



Oktyabrın 10-da Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Fəlsəfə və Sosiologiya İnstitutunun baş direktoru, professor İlham Məmmədzadə Pedaqoji Universitetdə olub.

İnstitutun nümayəndə heyətini qəbul edən Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov ADPU-nun zəngin təhsil ənənələri və aparılan davamlı islahatlar, tətbiq olunan yeniliklər haqqında məlumat verərək, pedaqoji kadr hazırlığını dövrün tələblərinə uyğun şəkildə təşkil etmək üçün universitetin daim müvafiq yerli və xarici elm-təhsil və tədqiqat müəssisələri ilə əlaqələrini genişləndirdiyini, müxtəlif mübadilə proqramları tətbiq etdiyini diqqətə çatdırıb.

Fəlsəfə və Sosiologiya İnstitutunun baş direktoru prof. İlham Məmmədzadə də öz növbəsində institutda aparılan tətqiqatlar haqqında məlumat verərək, qarşılıqlı əməkdaşlığın perspektivlərini qeyd edib, təhsil və tətqiqat fəaliyyətlərinin səmərəli inteqrasiyası baxımından Universitetlə İnstitut arasında əməkdaşlığın geniş imkanlar vəd etdiyini vurğulayıb. Yekunda ADPU ilə Fəlsəfə və Sosiologiya İnstitutu arasında əməkdaşlıq haqqında memorandum imzalanıb. Memorandumda birgə təhsil və tədqiqat fəaliyyətləri, kadr və tələbə heyətinin qarşılıqlı mübadiləsi kimi məsələlər yer alır. Daha sonra qonaqlar ADPU-nun tədris binası ilə tanış olublar.

# Təhsildə Yeni Çağırışlar IV Beynəlxalq Forumu




Oktyabrın 5-də Təhsildə Yeni Çağırışlar IV Beynəlxalq Forumu keçirilib. Beynəlxalq forumda Elm və Təhsil Nazirliyinin Aparat rəhbəri Mətin Kərimli, millət vəkili Ceyhun Məmmədov, ali məktəblərin rektorları, elm və təhsil ictimaiyyətinin nümayəndələri, dünyanın tanınmış təhsil mütəxəssisləri, məktəb direktorları, müəllimlər və digər qonaqlar iştirak ediblər.

Forumda açılış nitqi ilə çıxış edən Elm və Təhsil Nazirliyinin Aparat rəhbəri Mətin Kərimli tədbirin "Heydər Əliyev İli"nə həsr olunduğunu diqqətə çatdırıb, Ümummilli Liderin təhsilə, müəllimə hər zaman yüksək diqqət, qayğı ilə yanaşdığını və bu siyasətin Ölkə Prezidenti İlham Əliyev tərəfindən uğurla davam etdirildiyini vurğulayıb. Mətin Kərimli bildirib ki, Ali Baş Komandanın rəhbərliyi ilə əldə olunmuş qələbə təhsilimiz üçün də yeni prioritet və ehtiyacları müəyyən edir. Hazırda işğaldan azad olunmuş ərazilərdə çoxsaylı təhsil müəssisələri tikilir, növbəti 3 ildə də həmin ərazilərdə yeni məktəblərin tikintisi və fəaliyyətə başlaması nəzərdə tutulur.

Məktəblərdə mənəvi-psixoloji mühitin yaxşılaşdırılması, tərbiyə işinin səmərəli təşkili və məktəb-ailə münasibətlərinin düzgün qurulmasının ən vacib istiqamətlər olduğunu diqqətə çatdıran Aparat rəhbəri çıxışının sonunda iştirakçıları Beynəlxalq Müəllimlər Günü münasibətilə təbrik edib və forumun işinə uğurlar arzulayıb.

Foruma evsahibliyi edən Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru Cəfər Cəfərov qonaqları salamlayaraq universitet - məktəb işbirliyi modelinin tətbiq olunmasının zəruriliyindən danışıb. Rektor rəhbəri olduğu universitetin əsas məqsədinin gələcəyin müəllimini müasir dünyanın çağırışlarına uyğun hazırlamaq olduğunu bildirib.

Prof. C.Cəfərov qeyd edib ki, Pedaqoji Universitet təhsil sahəsində apardığı islahatlar çərçivəsində cari tədris ilindən pedaqoji internaturanın tətbiqinə başlayacaq və bu çərçivədə Qarabağ və Şərqi Zəngəzurda da tələbələrin təcrübə keçmələri planlaşdırılır.

Türkiyənin sabiq milli təhsil naziri, "Maya" Məktəblər Şəbəkəsinin qurucusu Ziya Səlçuk "Rəqəmsallıqdan təbiiliyə: təhsildə balans yaratmaq" mövzusunda təqdimatla çıxış edib. Müəllimlərin peşəkarlıq səviyyəsinin artırılması, texnoloji yeniliklərin tədris mühitinə təsiri, ümumilikdə müəllim-şagird münasibətlərinin önəminə diqqət çəkən Ziya Səlçuk forumda iştirak edən müəllimlərə öz tövsiyələrini də verib.

XXI Əsr Beynəlxalq Təhsil və İnnovasiya Mərkəzinin akademik direktoru Turan Zəkəriyəyeva "Xoşbəxt şagird = xoşbəxt şəxsiyyət" adlı təqdimatında biliklərin artma tezliyi, süni intellekt, icraedici fəaliyyət bacarıqlarının erkən yaşlarda qazandırılması mövzularına toxunub.

Foruma onlayn qoşulan yazıçı və psixoloq Azra Kohen "Zəka menyusu" adlı təqdimatla çıxış edib, uşaqlara öyrənməyi öyrətməyin vacibliyindən danışıb.

Sonra çıxış edən Harvard Universitetinin professoru, Qlobal Təhsil İnnovasiyaları Təşəbbüsünün direktoru Fernando Reimers Dayanıqlı İnkişaf Məqsədlərinin bir sıra dərs mövzuları içərisində tədrisinin əhəmiyyətini qeyd edib, şagirdlərin təcrübəəsaslı biliyə yiyələnməsinin önəmini diqqətə çatdırıb.

Daha sonra İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatının (İƏİT) baş katibinin təhsil siyasəti üzrə xüsusi müşaviri, təhsil və bacarıqlar üzrə direktoru Andreas Şleyxer "Real dünyanın təhsildən tələbləri" mövzusunda təqdimatla çıxış edib. 10-15 yaşlı uşaqlar arasında aparılan yaradıcılıq və rəqəmsal bacarıqlarla bağlı tədqiqatın nəticələrinə dair statistika təqdim edən Andreas Şleyxer analitik, koqnitiv və metakoqnitiv, sosial-emosional bacarıqların əhəmiyyətindən danışıb.

Forum çərçivəsində iştirakçıların sualları cavablandırılıb.

Qeyd edək ki, forumun əsas məqsədi təhsildə yeni çağırışları müzakirə etmək, müasir dövrün təhsil tələblərini nəzərdən keçirmək olub. Beynəlxalq forum Elm və Təhsil Nazirliyi, İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı (İƏİT), Təhsilin İnkişafı Fondu, "T - Network" təhsil işçilərinin təcrübə və kommunikasiya platforması, Təhsil İnstitutu, Azərbaycan Dövlət Pedaqoji Universitetinin təşkilatçılığı ilə hibrid formatda baş tutub.

## Milli Müdafiə Universitetinin nümayəndə heyəti ADPU-da olub

Oktyabrın 11-də Azərbaycan Respublikası Müdafiə Nazirliyinin Milli Müdafiə Universitetinin Hərbi Elmi Tədqiqat İnstitutunun rektoru, general-mayor Arif Həsənovun rəhbərlik etdiyi nümayəndə heyəti ADPU-da tələbələrlə görüşüb.

Tədbirdə əvvəlcə xalqımızın Ümummilli Lideri Heydər Əliyevin, eləcə də Azərbaycanın suverenliyi, ərazi bütövlüyü və torpaqlarımızın azadlığı uğrunda canından keçən Vətən övladlarının xatirəsi bir dəqiqəlik sükutla yad olundu, Dövlət Himni səsləndirildi.

Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov giriş sözündə gənc nəslin milli-mənəvi dəyərlərə sadiqlik, dövlətçilik və vətənpərvərlik ruhunda tərbiyəsinin vacibliyini vurğuladı.



Çıxış edən Hərbi Elmi Tədqiqat İnstitutunun rektoru, general-mayor Arif Həsənov Ali Baş Komandan cənab Prezident İlham Əliyevin daimi diqqət mərkəzində olan müzəffər Azərbaycan Ordusunun yüksək döyüş hazırlığından söz açdı.

Vətən müharibəsi qəhrəmanı, polkovnik Nizami Mövlanov və polkovnik-leytenant Firavan Şərfəliyev 44 günlük savaşla bağlı maraqlı məqamları tələbələrlə bölüşdülər.

Sonra tələbələrə hərbi qulluqçularımızın döyüş hazırlığı, əsgər və zabitlərimizin gündəlik fəaliyyəti haqqında videoçarx təqdim oldu, onları maraqlandıran suallar cavablandırıldı.

Qeyd edək ki, ADPU-nun rəhbərliyi və professor-müəllim heyətinin də iştirak etdiyi görüşdə elm və təhsil sahəsində əməkdaşlıq haqqında bir sıra müzakirələr aparıldı.

## Kopenhagen Universitet Kollecinin müəllimləri ADPU-nun qonağı olublar



2-6 oktyabr tarixlərində ERASMUS+ layihəsi çərçivəsində ADPU-nun Tarix və coğrafiya fakültəsinin Azərbaycan coğrafiyası və coğrafiyanın tədrisi texnologiyası (CTT) kafedrası ilə əməkdaşlıq edən Kopenhagen Universitet Kollecinin nümayəndələri Peter Mikael Hansen və Marie Ditte Pagaard universitetdə qonaq olub.

Oktyabrın 2-də Tarix və coğrafiya fakültəsinin dekanı, dos. Asif Axundov, Azərbaycan coğrafiyası və CTT kafedrasının müdiri, dos. Oqtay Alxasov və fakültə əməkdaşları ilə görüşən nümayəndələr fakültənin iş strukturu və fəaliyyəti ilə yaxından tanış oldular. Daha sonra Qala Arxeoloji-Etnoqrafik Muzey Kompleksinə səyahət edərək, Azərbaycanın tarixi haqqında geniş məlumatlar əldə etdilər.

Növbəti gün qonaqlar ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Təlim-Tədris mərkəzində "Avropada təhsil" mövzusunda seminarda iştirak edərək Avropa təhsilinin fərqliliklərindən danışıblar.

Oktyabrın 4-də isə danimarkalı mütəxəssislər ADPU-nun Tarix və coğrafiya fakültəsində tələbələr üçün "Davamlı inkişaf" mövzusunda, sonra isə müəllimlərlə açıq havada keçirilən dərslərlə bağlı seminar təşkil edərək təcrübələrini bölüşmüşlər.

Oktyabrın 5-də UNESCO-nun mədəni irs siyahısına daxil olan Qobustan Dövlət Tarixi və Bədii Qoruğunu ziyarət edən nümayəndələr daha sonra respublikamıza xas olan palçıq vulkanları ilə yaxından tanış oldular. Proqramın sonuncu günü isə Kopenhagen Universitet Kollecinin coğrafiyaçı mütəxəssislərinin Qubaya səfərləri təşkil olunub və səfər çərçivəsində onlar ADPU-nun Quba filialında oldular.

## Litvanın Vytautas Magnus Universitetinin müəllimləri ADPU-da olublar



Oktyabrın 16-dan 20-dək Litvanın Vytautas Magnus Universitetinin (VMU) müəllimləri – Təbiət və Texnologiya Elmləri Elmi-Tədqiqat İnstitutunun direktoru, professor Algimantas Paulauskas və Biologiya kafedrasının müdiri Jana Radzijevskaja ADPU-da səfərdə olublar.

Səfərin məqsədi ADPU-nun Kimya və biologiya fakültəsində tədris ixtisasları üzrə mühazirələr keçirmək, tələbə və müəllim heyəti ilə müzakirələr aparmaq və bu sahədə əməkdaşlıq əlaqələrini genişləndirməkdir.

Səfər çərçivəsində qonaqlar oktyabrın 18-də ADPU-nun rektoru, prof. Cəfər Cəfərov, Beynəlxalq əlaqələr üzrə prorektor, prof. Mahirə Hüseynova və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova ilə görüşüblər. Görüş zamanı tərəflər təmsil etdikləri universitetlərin tarixi, strukturu, təhsil proqramları barədə bir-birini məlumatlandırıb, beynəlxalq tədqiqatlarda birgə çalışmaq, universitetlərarası əlaqələri inkişaf etdirmək, ikili diplom proqramları sahəsində mümkün əməkdaşlıq imkanları araşdırılıb və belə əməkdaşlığın qarşılıqlı faydalı olacağı vurğulanıb.

## Bartın Universitetinin müəllimi ERASMUS+KAI proqramı çərçivəsində ADPU-da mobillikdə iştirak edib



Oktyabrın 2-dən 6-dək Türkiyənin Bartın Universitetinin müəllimi Deniz Ayşegül Söğüt ADPU-da ERASMUS+KA1 proqramı çərçivəsində mobillikdə iştirak edib. Səfərin məqsədi ADPU-nun rəhbərliyi və müəllim heyəti ilə əməkdaşlığın genişləndirilməsi istiqamətində müzakirələr aparmaq, təqdimatlar keçirmək, bilik və təcrübə mübadiləsi aparmaq olub.

Səfər çərçivəsində oktyabrın 2-i D.A.Söğüt ADPU-nun prorektoru, prof. Mahirə Hüseynova ilə görüşüb və Beynəlxalq əlaqələr şöbəsi ilə tanış olub. Həmçinin Türk dili və ədəbiyyatı müəllimliyi ixtisasında təhsil alan tələbələr ilə görüşüb. Oktyabrın 3-də D.A.Söğüt Məktəbəqədər təhsil fakültəsinin müəllimləri ilə, növbəti gün isə həmin fakültənin tələbələri ilə görüşərək öz biliklərini bölüşmüş, eyni zamanda ADPU-nun rektoru, prof. Cəfər Cəfərov, tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova ilə görüşərək universitetdə gördüyü işlər barədə rəhbərliyi məlumatlandırıb.

Oktyabrın 5-də isə qonaq müəllim Məktəbəqədər təhsil fakültəsində dərslərdə iştirak etmişdir. Qeyd edək ki, bu səfər ADPU-nun Bartın Universiteti ilə əməkdaşlığı çərçivəsində 2022-ci ildən bəri ilk akademik heyət mübadiləsidir.

## Türkiyəli akademik nümayəndələr ADPU-nun qonağı olub



Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və Beynəlxalq layihələr və qrantlar şöbəsinin mütəxəssisi Ülkər Abdullayeva, Türkiyənin MEF Universitetinin Təhsil fakültəsinin dekanı, professor Mustafa Özcan, Ankara valisinin köməkçisi Ayhan Özkan, Şimali Kipr Türk Respublikasının Ankaradakı Səfirliyinin təhsil və mədəniyyət attaşesi Ahmet Arslan və Türkiyə EYUDER Təhsil Dərnəyinin Azərbaycan təmsilçisi Gülnurə Babaşova iştirak ediblər.

Görüş əsnasında tərəflər təmsil etdikləri ali təhsil müəssisələri haqqında bir-birlərinə ətraflı məlumat verərək mümkün əməkdaşlıq imkanları müzakirə olunub. Qonaqlar ADPU-nun inzibati binası ilə tanış olublar.

## MEF Universitetinin "Məktəbdə universitet" modeli



Oktyabrın 10-da ADPU-da Türkiyənin MEF Universitetinin Təhsil fakültəsinin dekanı, professor Mustafa Özcanın iştirakı ilə fakültə rəhbərləri ilə görüş keçirildi. İlk növbədə, ADPU-nun rektoru, prof. Cəfər Cəfərov çıxış edərək qonaq və qonağın təmsil etdiyi universitet haqqında məlumat verdi.

Görüşün əsas məqsədi MEF Universitetində tətbiq edilən "Okulda Universite: Öğretmen eğitimi" (Məktəbdə universitet: Müəllim hazırlığı) adlı təhsil modeli haqqında ADPU-nun fakültə rəhbərlərini məlumatlandırmaqdan ibarət olub. Mustafa Özcan nəzəriyyə və praktikanı birləşdirən bir proqram kimi hazırlanmış "Məktəbdə universitet" modeli barədə təqdimatla çıxış edib. Pedaqoji fəaliyyətdə daha uğurlu kadr hazırlanması üçün müəllim hazırlığının elə müəllimlərin əsas iş yeri olan məktəblərdən başlamasının önəmini vurğulayıb.

Sonda isə bu model üzrə ADPU-da pilot layihə həyata keçirilməsinin mümkünlüyü barədə fikirlər irəli sürüldü. Müzakirə formatında davam edən görüş fakültə rəhbərlərini maraqlandıran sualların cavablandırılması ilə başa çatdı.

## İqtisadi Əməkdaşlıq Təşkilatının Təhsil İnstitutunun nümayəndə heyəti ilə görüş




Oktyabrın 10-da Dövlət Pedaqoji Universitetində İqtisadi Əməkdaşlıq Təşkilatının Təhsil İnstitutunun (İƏT Tİ) rəhbərliyi ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova, İqtisadi Əməkdaşlıq Təşkilatının Təhsil İnstitutunun prezidenti, professor Mehmet Akif Kireçci və İƏT Tİ rəhbərinin protokol müdiri Qonca Biltekin iştirak edib.

İlk növbədə, ADPU-nun rektoru, prof. Cəfər Cəfərov və İƏTTİ-nin prezidenti, prof. Mehmet Akif Kireçci təmsil etdikləri universitetlər haqqında bir-birlərinə məlumat verdilər.

Görüş zamanı təhsil sahəsində əməkdaşlığın inkişaf etdirilməsi, müəllim-tələbə mübadiləsi imkanları, türk dillərinin öyrədilməsi, məqalələrin çapı, birgə konfransların təşkili, müəllim hazırlığında istifadə olunan model və qarşılıqlı maraq doğuran sahələrdə görülə biləcək mümkün işlər barədə bir çox məsələlər müzakirə edildi.

Sonda qonaqlara xatirə hədiyyələri təqdim edilib və qonaqlar ADPU-nun inzibati binası ilə tanış olublar.

## ADPU ilə Ankara Sosial Elmlər Universiteti arasında memorandum və ERASMUS+ KA1 müqaviləsi imzalanıb



Oktyabrın 12-də ADPU-da Türkiyənin Ankara Sosial Elmlər Universitetinin rektoru ilə görüş keçirilib.

Görüşdə ADPU-nu universitetin rektoru, professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və şöbənin mütəxəssisi Rufanə Əhmədova, Ankara Sosial Elmlər Universitetini isə rektor, prof. Musa Kazım Arıcan, Xüsusi Katibliyin müdiri Serdar Çalımlı təmsil ediblər. Görüşdə, həmçinin TÜRKSOY-un Muzeylər İttifaqının baş koordinatoru Cavid Mövsümlü də iştirak edib.

Görüşün məqsədi tanışlıq və nəzakət ziyarəti, mümkün əməkdaşlıq əlaqələrinin müzakirəsi və bu çərçivədə əməkdaşlıq protokolunun imzalanmasıdır.

Görüş əsnasında tərəflər təmsil etdikləri ali təhsil müəssisələri haqqında bir-birlərinə ətraflı məlumat verərək əməkdaşlıq imkanlarını müzakirə ediblər. Yekunda rektorlar prof. Cəfər Cəfərov və prof. Musa Kazım Arıcan universitetlər arasında qarşılıqlı əməkdaşlığa dair memorandum və ERASMUS+ KA1 çərçivəsində müqavilə imzalayıblar.

Sonra qonaqlar ADPU-nun TÜRKSOY kafedrası ilə tanış olublar.

## Şərqi Aralıq dənizi Universitetinin professoru Qüdrət Özersay ADPU-nun qonağı olub




Oktyabrın 19-da Türkiyənin Şərqi Aralıq dənizi Universitetinin Siyasət və beynəlxalq əlaqələr fakültəsinin müəllimi, Xalq Partiyasının sədri, Şimali Kipr Türk Respublikasının (ŞKTR) keçmiş xarici işlər naziri, professor Qüdrət Özersayın iştirakı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetində "Son qlobal proseslər fonunda ŞKTR və Azərbaycanın əhəmiyyətinin artması, Zəngəzur dəhlizi məsələsində haqlı mövqe" mövzusunda dairəvi masa keçirilib. Görüşdə ADPU-nun rektoru, prof. Cəfər Cəfərov, prorektorlar və fakültə rəhbərləri iştirak ediblər. Rektor, prof. Cəfər Cəfərov ilk öncə qonaq haqqında iştirakçıları məlumatlandırıb.

Prof. Qüdrət Özersay çıxışında Şimalı Kipr Türk Respublikasının tarixindən, Azərbaycanın 44 günlük Vətən müharibəsi zamanı əldə etdiyi uğurlardan, işğal altıda olan torpaqlarımızın tamamilə düşmən əsarətindən qurtulmasından, həmçinin Zəngəzur koridorunun əhəmiyyətindən danışıb.

Görüşdən sonra Qüdrət Özersay ADPU-nun inzibati binası ilə tanış oldu.

## Türkiyənin Qafqaz Universitetinin nümayəndə heyəti ADPU-da olub



Oktyabrın 23-də Türkiyənin Qafqaz Universitetinin (Qars) nümayəndə heyəti ilə görüş keçirilib.

Görüşdə Qafqaz Universitetinin rektoru, professor Hüsnü Kapu, prorektor Engin Kılıç, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Hacali Necefoğlu, ADPU-dan isə universitetin rektoru, professor Cəfər Cəfərov, Beynəlxalq əlaqələr üzrə prorektor, professor Mahirə Hüseynova, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov və Beynəlxalq əlaqələr şöbəsinin mütəxəssisi Gülnar Ələkbərova iştirak ediblər. ADPU-nun rektoru Cəfər Cəfərov qonaqları salamlayaraq universitet haqqında məlumat verdi. Rektor Hüsnü Kapu ölkələrimizin məmnunluq doğuran dostluq, qardaşlıq münasibətlərindən, eyni zamanda ADPU ilə əməkdaşlıqda xüsusi maraq kəsb edən məsələlər barəsində də ətraflı danışaraq, ortaq tədris sahələrindən və bu sahədə daha sıx əməkdaşlıq imkanlarından bəhs edib.

Həmçinin, görüşdə təhsil sahəsində əməkdaşlığın inkişaf etdirilməsi, müəllim-tələbə mübadiləsi imkanları, türk dillərinin öyrədilməsi və qarşılıqlı maraq doğuran sahələrdə görülə biləcək mümkün işlər barədə müzakirələr aparılıb. Sonda qonaqlar ADPU-nun inzibati binası ilə tanış olublar.

## Keyfiyyət təminatı ilə bağlı görüş keçirilib



Oktyabrın 24-də ADPU-nun rektoru yanında Keyfiyyət komissiyası və Keyfiyyətin təminatı şöbəsi nəzdində fəaliyyət göstərən işçi qrup üzvləri ilə birgə görüş keçirilib.

İclas Keyfiyyət komissiyasının sədri, tədris işləri üzrə prorektor, dosnet Eldar Aslanovun giriş sözü ilə başladı. Sonra Keyfiyyətin təminatı şöbəsində təcrübə proqramında iştirak etmiş tələbələrə sertifikatlar təqdim olundu.

İclasda reytinq qiymətləndirilməsi, bununla bağlı məmnuniyyət sorğusu və müəllimlərin kodlaşdırılması ilə bağlı bir sıra məsələlərə toxunuldu.

Dos. Eldar Aslanov qeyd etdi ki, Keyfiyyət komissiyasının sistemli şəkildə təşkil olunması aktual məsələyə çevrilmişdir. Komissiyanın tərkibində əmək bazarının təmsilçilərinin iştirakı ümumilikdə keyfiyyətin artırılmasına töhfə verəcək. Bu xüsusda xarici maraqlı tərəf olaraq 7 nömrəli tam orta məktəbin direktoru Könül Təhməzova, Bakı şəhəri üzrə Təhsil İdarəsinin Keyfiyyətə nəzarət sektorunun müdiri Anar Mustafazadə də öz fikirlərini bildirdilər. Keyfiyyətin təminatı şöbəsinin müdiri dos. Qalib Şərifov müəllimlərin məlumat bazasının bir sistem üzərindən toplanılması üçün kodlaşdırma prosesinin aktuallığı, üstünlüyü və aparılma mexanizmi haqqında təqdimatla çıxış etdi. Daha sonra reytinq qiymətləndirilməsinə dair dəyişikliklərlə bağlı təkliflər heyət üzvlərinin nəzərinə çatdırıldı, məsələ ilə bağlı müzakirə aparıldı.

Sonda şöbənin əməkdaşları Jalə Kərimova və Çingiz Baxşıyev reytinq qiymətləndirilməsi ilə bağlı şöbə tərəfindən aparılan məmnuniyyət sorğusunun nəticələri əsasında filiallar və fakültələr üzrə ümumi təhlil və statistikanı təqdim etdilər.

# "Qərbi Azərbaycana doğru - Vətən bizi səsləyir" mövzusunda tədbir keçirilib, "Zəfər guşəsi"nin açılışı olub






Oktyabrın 27-də ADPU-da Qərbi Azərbaycan İcması (QAİ) ilə birgə Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunmuş "Qərbi Azərbaycana doğru – Vətən bizi səsləyir" mövzusunda tədbir keçirilib.

Tədbirdə Milli Məclisin deputatları, ictiami-siyasi xadimlər, elmi-pedaqoji ictimaiyyətin nümayəndələri və Qərbi Azərbaycan ziyalıları iştirak ediblər.

Tədbirdən əvvəl Filologiya fakültəsi tərəfindən hazırlanan "Zəfər guşəsi"nin açılışı olub. Guşə iki hissədən ibarətdir, – birinci hissədə Pedaqoji Universitetin Birinci Qarabağ müharibəsi və Vətən müharibəsində şəhid olmuş tələbə və məzunlarının adları əks olunub, ikinci hissədə isə "Dəmir yumruq" ətrafında Şuşa qalasının işğaldan azad olunmasını əks etdirən möhtəşəm kompozisiya tədqim olunur. Qeyd edək ki, ADPU-nun tələbə və məzunlarından I Qarabağ müharibəsində adları məlum olan 29 nəfər, Vətən müharibəsində 14 nəfər, 2022-ci ilin sentyabr döyüşlərində isə 1 məzun şəhid olmuşdur. Onlardan 3 nəfəri Azərbaycanın Milli Qəhrəmanıdır, 3 nəfəri isə "Azərbaycan Bayrağı" ordeni ilə təltif edilmişdir.

ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynovanın dəstəyi və təşəbbüsü ilə keçirilən tədbirdə iştirakçılar, Qərbi Azərbaycanın folklor sənəti nümunələri, tarixi, etnoqrafiyası ilə bağlı kompozisiyalar, kitab sərgisi və Dərələyəz mahalının tanınmış simalarının fotoşəkilləri ilə tanış olub, Universitetdəki Heydər Əliyev muzeyini ziyarət ediblər.

Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi və şəhidlərin əziz xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayan tədbirdə giriş sözü ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov Azərbycan Respublikasının Prezidenti cənab İlham Əliyevin oktyabrın 15-də Xankəndi, Xocalı, Xocavənd, Ağdərə və Əsgəranda Dövlət Bayrağını ucaltmasını xatırladaraq, bu gün xalq olaraq möhtəşəm tarixi dövr yaşadığımızı vurğulayıb.

O bildirib ki, əsası Ümummilli Liderimiz Heydər Əliyev tərəfindən qoyulan dövlətçilik siyasətinin layiqli sərkərdəsi olan cənab Prezidentin rəhbərliyi ilə Azərbaycan öz gücü hesabına ərazi bütövlüyü və suverenliyini bərpa etdi, bu gün nəinki Qarabağ və Şərqi Zəngəzura qayıdırıq, eyni zamanda Qərbi Azərbaycana qayıdış konsepsiyasının reallaşdırılmasına başlanılıb.

Vurğulanıb ki, 2022-ci il dekabr ayının 24-də Qərbi Azərbaycan İcmasının yeni inzibati binasındakı nitqində Prezident İlham Əliyev İcma ziyalılarının qarşısında qərbi azərbaycanlıların öz tarixi vətənlərinə qayıda bilməsi üçün Azərbaycan dövlətinin köməyinə arxalana biləcəyini bəyan etdi. Ölkə başçısının bəyanatı 1997-ci ildə Prezident Heydər Əliyevin imzaladığı "1948-1953-cü illərdə azərbaycanlıların Ermənistan SSR ərazisindəki tarixi-etnik torpaqlarından kütləvi surətdə deportasiyası haqqında" Fərmandan irəli gələn vəzifələrin icrasına yönələn addımların davamı idi.

Bu, XIX əsrin sonları – XX əsrin əvvəllərindən – bugünkü Ermənistan Respublikasının ərazisindən azərbaycanlıların minillik tarixi ərazilərindən zorla çıxarılması ilə başlayan və 100 ildən artıq davam edən prosesə qarşı hüquqi-siyasi mübarizənin başlanğıcı idi. Biz yüz minlərlə azərbaycanlının beynəlxalq konvensiyalarla təsbit olunan əzəli haqqına qovuşacağına inanırıq.

Qərbi Azərbaycan İcmasının İdarə Heyətinin sədri, Milli Məclisin deputatı Əziz Ələkbərli, ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, Filologiya fakültəsinin dekanı v.i.e., QAİ-nin Dərələyəz mahalının Keşkənd rayonu üzrə icma sədri, prof. Mahirə Hüseynova və Paşalı rayonu üzrə icma sədri Faiq Xudayev mövzu ətrafında geniş məruzələr etdi. Məruzələrdə Qərbi Azərbaycan irsinin araşdırılması, Respublika və beynəlxalq səviyyədə təbliği bu gün informasiya və elm cəbhələrimizin önündə duran vacib vəzifələr kimi qeyd olunmuşdur. Bu istiqamətdə əsaslı elmi araşdırmaların aparılmasında mərhum akademik Həsən Mirzəyevin miqyaslı tətqiqatlarının mühüm mənbə rolunu oynadığı məruzəçilərin çıxışlarında xüsusi vurğulanmışdır.

Tədbirdə çıxış edənlərdən Milli Məclisin deputatları Fəzail Ağamalı, Hikmət Babaoğlu, Məlahət İbrahimqızı, İcma nümayəndələrindən Səməd Vəkilov və Məhəmməd Rəsuloğlu, Qərbi Azərbaycan İcması Ağsaqqallar Şurasının üzvü, akademik Abel Məhərrəmov və başqaları əzəli torpaqlarımıza qayıdışla bağlı ali təhsil müəssisələrində bu tip geniş maarifləndirmə tədbirlərinin keçirilməsinin əhəmiyyətini vurğulamış, ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektorluğuna təşəkkür etmişlər. Tədbir incəsənət nümayəndələri və Universitetdə fəaliyyət göstərən "Meh" ədəbi dərnəyinin üzvlərinin ifasında bədii hissə ilə davam etmişdir.

Sonda Qərbi Azərbaycanla bağlı videoçarx nümayiş olunub, xatirə şəkili çəkdirilib.

# ADPU Avropa Komissiyası tərəfindən maliyyələşdirilən ENGAGE layihəsinin assosiativ tərəfdaşıdır



Oktyabrın 23-də ADPU-nun assosiativ tərəfdaş olaraq qoşulduğu, Mingəçevir Dövlət Universitetinin (MDU) koordinatoru olduğu və Avropa Komissiyası (AK) tərəfindən maliyyələşdirilən "Azərbaycan ali təhsil müəssisələrində davamlı sahibkarlıq ekosisteminin gücləndirilməsi" (ENGAGE) Erasmus+ layihəsi çərçivəsində növbəti təlimlər Portuqaliyanın Ali Texniki İnstitutunda öz işinə başlayıb.

23-27 oktyabr tarixlərində Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin nümayəndəsi, layihədə iştirak edən 11 Azərbaycan ali təhsil müəssisəsinin rektorları, prorektorları, inzibati və akademik heyət üzvləri, eləcə də layihənin İsveç, Polşa, İspaniya və Estoniyadan olan xarici tərəfdaş universitetlərinin nümayəndə heyətləri Portuqaliyaya işgüzar səfər ediblər. Təlim səfərində ADPU-nu Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova təmsil edib. Təlimlərin əsas məqsədi innovasiya və sahibkarlıq fəaliyyətləri və tədbirlərinin universitetdə tətbiqinə dair Portuqaliya ali təhsil müəssisələrinin qabaqcıl təcrübələrinin öyrənilməsidir.

5 günlük təlim proqramına uyğun olaraq iştirakçılar texnologiya mərkəzləri, sosial innovasiya laboratoriyası, texnologiya əsaslı sahibkarlıq proqramları kimi mövzularda təqdimatlarla tanış olmuş, müzakirələr aparmış, o cümlədən Lissabonda yerləşən bir sıra texnologiya laboratoriyaları və innovasiya mərkəzlərini ziyarət etmişlər.

Təlimlərin yekununda layihənin cari vəziyyətinin təhlili aparılıb və gələcək 6 ay üçün fəaliyyət planı tərtib edilib, eləcə də layihə konsorsiumunun üzvü olan ali təhsil müəssisələrinin məsul şəxslərinin iştirakı ilə 5 gün müddətində keçirilən təlim və təqdimatlara əsasən komanda işləri təşkil olunub və Portuqaliyalı partnyorlarla qarşılıqlı fikir mübadilələri aparılıb.

# ADPU-ya yeni qəbul olunan doktorant və dissertantlara vəsiqələr təqdim olunub

Oktyabrın 12-də Pedaqoji Universitetin fəlsəfə doktorluğu proqramı üzrə doktorantura və dissertanturasına qəbul olunmuş doktorant və dissertantlarla görüş keçirilib.

Görüşdə Universitetin rektoru, professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov və Magistratura və doktorantura şöbəsinin müdiri, s.e.ü.f.d. Rəşad Sadıqov iştirak edib.

Çıxış edən rektor, prof. Cəfər Cəfərov doktorant və dissertantları təbrik edib, yeni elmi-pedaqoji tədqiqatlar, dövrün trendləri və yeni pedaqoji yanaşmalar haqqında danışaraq, Universitetdə magistratura və doktoranturaya qəbul olunanların kəmiyyət və keyfiyyət göstəricilərini artırmaq istiqamətində ardıcıl iş aparıldığını, təhsilə dair beynəlxalq forum və konfransların təşkil olunduğunu, kollektivin gərgin əməyi sayəsində bir çox nailiyyətlər əldə olunduğunu diqqətə çatdırıb.

Rektor vurğulayıb ki, rəqabətqabiliyyətli elmi-pedaqoji potensialın gücləndirilməsi üçün gənc tədqiqatçılar da mövzu seçimlərində və tədqiqatlarında ən yeni elmi nailiyyətlərə və istiqamətlərə istinad etməlidirlər.

Elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov bildirib ki, cari ildə fəlsəfə doktorluğu proqramı üzrə ADPU-da qəbul aparılan 27 yerə 51 nəfər iddia edib, nəticədə gərgin müsabiqə mərhələlərini uğurla keçən 10 nəfər namizəd doktorantura və dissertanturaya qəbul olunub.

Daha sonra doktorant və dissertantlara vəsiqələr təqdim olunub, onlar öz təəssüratlarını bölüşərək elmi-tədqiqat istiqamətləri haqqında məlumat veriblər.









# "Məktəb Liderliyi Proqramı"nın II çağırışının açılış mərasimi keçirilib



Oktyabrın 28-də Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi (AR ETN) və Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Strateji İnkişaf Mərkəzinin birgə əməkdaşlığı ilə həyata keçirilən, gələcəkdə dövlət ümumtəhsil müəssisələrində direktor vəzifəsində çalışmaq arzusunda olan pedaqoji kadrların səriştələrinin artırılmasını hədəfləyən "Məktəb Liderliyi Proqramı"nın II çağırışının açılış mərasimi keçirilib.

Tədbirdə Pedaqoji Universitetin rəhbərliyi, o cümlədən Bakı Şəhəri üzrə Təhsil İdarəsinin (BŞTİ) nümayəndələri, proqramın təlimçiləri, I çağırışın məzunları və II çağırış üçün seçilmiş müdavimlər iştirak ediblər.

Əvvəlcə, ADPU-nun xor kollektivinin ifasında Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib, "Qələbə" marşı ifa olunub. Ümummilli Lider Heydər Əliyevin və şəhidlərimizin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Açılış nitqi ilə çıxış edən Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərov diqqətə çatdırıb ki, böyük Zəfərdən və suverenliyimizin tam bərqərar edilməsindən sonra təhsilimizin qarşısında duran yeni çağırışları, müasir inkişaf meyillərini nəzərə alan ADPU öz üzərinə düşən birbaşa vəzifələrdən əlavə, zəngin ənənələrinə söykənərək cəmiyyətin elm və təhsil sahəsində inkişafına fayda verən müxtəlif layihələr icra edir ki, bunlar arasında ən uğurlularından biri də artıq iki ildir davam edən "Məktəb liderliyi" proqramıdır.

Proqram haqqında təqdimat edən ADPU-nun strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva bildirib ki, proqram məktəb nəticələrini yüksəltmək və şagird nailiyyətlərini artırmaq məqsədilə nəzəri və təcrübi öyrənmə imkanları təmin edərək müasir çağırışlara cavab verən təhsil liderlərinin hazırlanmasını hədəfləyir. K.Pirverdiyeva vurğulayıb ki, "Məktəb Liderliyi Proqramı" eyni zamanda məktəb idarəedicilərinin şəbəkələşməsi üçün yaxşı imkandır.

Təqdimatda diqqətə çatdırılıb ki, Proqramın II çağırışı zamanı keçirilən imtahanlardan sonra 296 nəfərlə əyani və onlayn müsahibələr təşkil olunub, eyni zamanda müsahibə prosesi ilə bağlı məmnuniyyət sorğusu keçirilib. Sorğuda müsahibənin təşkili, namizədlərin öz cavablarından razılıq səviyyəsi ölçülüb və əksər iştirakçıların prosesdən məmnun olduğu müəyyən edilib. Müsahibələrdən sonra Proqramın II çağırışında iştirak etmək üçün 134 nəfər seçilib. Seçilən 134 nəfərdən 35-i direktor, 38-i müavin, 59-u müəllim, 2 nəfəri isə məktəb psixoloqudur. Müdavimlərin 58 nəfəri Bakı və Sumqayıt şəhərlərində yerləşən məktəblərin, 76 nəfəri isə region məktəblərinin nümayəndələridir.

Layihə rəhbəri qeyd edib ki, Proqramın I çağırış üzrə məzunları ilə mütəmadi sorğular keçirilib, regional təhsil idarələrinin əməkdaşları, məktəb direktorları ilə fokus qrup müzakirələri təşkil edilərək proqramın məzmunu ehtiyaclara müvafiq olaraq təkmilləşdirilib. Proqram müddətində məktəblərə səfərlərin təşkili, qonaq spikerlərin dəvəti, mədəni tədbirlərdə iştirak və s. kimi fəaliyyətlər də planlaşdırılır.

"Məktəb Liderliyi Proqramı"nın I çağırış məzunlarından Gəncə-Daşkəsən Regional Təhsil İdarəsinin Tədrisin keyfiyyəti sektorunun müdiri Sevinc Quliyeva, Səbail rayonu 329 nömrəli məktəbin direktoru Elnur Mirzəyev, 2 nömrəli Texniki-Humanitar liseyin direktoru Turanə Məcidli və İ.Hacıyev adına "Tərəqqi" texniki-humanitar liseyinin müəllimi Sona Kərimova layihə haqqında təəssüratlarını bölüşdükdən sonra ümumilikdə 145 saatlıq tədris modulları üzrə təlimçilər təqdimatlar ediblər.

Təlimçilərdən Yuliya Kərimova "Tədrisin təşkili və idarə edilməsi" tədris modulu, Elmir Şirinov və Leyla Abbaslı "Təhsildə qiymətləndirmə və monitorinq" tədris modulu, Mətanət Məmmədova "Məktəb həyatinin idarə olunması" tədris modulu, Şövkət Aslanova, Sevinc İsmayılova və Aydan Əzimzadə "Məktəbdə səmərəli ünsiyyətin, sağlam psixoloji mühitin təşkili və idarə edilməsi" tədris modulu, Yeganə Abdullayeva isə "Məktəb sənədləri ilə iş" tədris modulu haqqında geniş məlumat veriblər.

Xatirə fotolarının çəkdirilməsindən sonra açılış tədbiri iştirakçılar üçün mədəni proqramla davam etdirilib. Belə ki, iştirakçıların bir qismi Azərbaycan Dövlət Pantomim Teatrında "Mən və mən" tamaşasını, bir qismi isə Şuşa Dövlət Musiqili Dram Teatrında İlyas Əfəndiyevin "Sən həmişə mənimləsən" dramı əsasında hazırlanmış tamaşanı izləyiblər.

## "ADPU 2030 Strateji İnkişaf Planı"nın hazırlanması üçün işçi qruplar yaradılır



Oktyabrın 31-də ADPU-nun Elmi Şurasının iclası keçirilib. Rektor, professor Cəfər Cəfərov giriş nitqində ötən dövr ərzində baş verən yeniliklərdən söz açaraq tədris ilinin başlanmasından keçən qısa zamanda Universitetdə beynəlxalq əlaqələrin inkişafı, ictimai-sosial tədbirlər və elmi-pedaqoji layihələrin icrası baxımından xeyli iş görüldüyünü diqqətə çatdırıb. Prof. Cəfər Cəfərov çıxışının sonunda İbtidai təhsil fakültəsinin dekanı, psixologiya elmləri doktoru Qızxanım Qəhrəmanovaya professor attestatını təqdim edib.

Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov "ADPU 2030 Strateji İnkişaf Planı"nın (SİP) hazırlanması haqqında məruzə ilə çıxış edərək, aparılan təhlillər nəticəsində yeni SİP-in hazırlanması üçün müəyyən olunmuş əsas strateji istiqamətlər üzrə işçi qrupların yaradılaraq, qrafik üzrə işçi qrupların hazırladıqları təkliflər əsasında yekun strateji planın təsdiqlənəcəyini diqqətə çatdırıb. Nəzərdə tutulan əsas strateji istiqamətlər əsas alınmaqla İnnovativ tədris, öyrənmə və qiymətləndirmə üsulları işçi qrupu, Elm işçi qrupu, Beynəlmiləlləşdirmə işçi qrupu, Tələbə mərkəzli yanaşma işçi qrupu, Əmək bazarı ilə əlaqə işçi qrupu, Daxili keyfiyyət təminatı işçi qrupu və İnfrastruktur və rəqəmsallaşma işçi qrupu yaradılacaq. Qeyd olunan işçi qruplar "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər", "Azərbaycan Respublikasının 2022-2026-cı illərdə sosial-iqtisadi inkişaf Strategiyası", "Azərbaycan Respublikasının işğaldan azad edilmiş ərazilərinə Böyük Qayıdışa dair I Dövlət Proqramı", "ADPU 2021 Strateji İnkişaf Planı" və ADPU-nun institusional akkreditasiyası üzrə yekun hesabat nəzərə alınmaqla əvvəlcə adıçəkilən istiqamətlər üzrə Universitetin GZİT analizini hazırlayacaq, bunun əsasında isə SİP tərtib olunaraq növbəti ilin əvvəllərində təsdiq olunacaq.

Təhsildə Keyfiyyət Təminatı Agentliyinin (TKTA) Akkreditasiya komissiyasının yekun hesabatında göstərilən tövsiyə və göstərişlərin icrasına dair ADPU-nun Fəaliyyət Planı layihəsinin müzakirəsi haqqında hesabatı təqdim edən Keyfiyyətin təminatı şöbəsinin müdiri, dosent Qalib Şərifov bildirib ki, yekun akkreditasiya hesabatında göstərilən 77 tövsiyə əsasında əsas istiqamətlər üzrə görüləcək işlər fəaliyyət planı layihəsində əks olunur. Bunlar Universitetin inkişaf strategiyası, keyfiyyət təminatı, audit və özünüqiymətləndirmə hesabatları, idarəetmə, tədris, infrastruktur və beynəlmiləlləşmə kimi sahələri əhatə edir.

Cari məsələlərin müzakirəsində dərslik və monoqrafiyaların nəşrinə icazə veilməsi, professor və dosent elmi adlarının verilməsi üçün AAK qarşısında vəsatət qaldırılması və s. müzakirə olunub.

Yekunda müzakirə olunan məsələlər üzrə müvafiq qərarlar qəbul edilib.

## Pedaqoji Universitetin rəhbərliyi Təhsilin İnkişafı Forumunda iştirak edib



ADPU-nun rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, strateji inkişaf məsələləri üzrə prorektoru Könül Pirverdiyeva, rektor müşaviri Ümid Mehdiyev və ADPU nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin direktoru, dosent İsrayıl İsgəndərov Elm və Təhsil Nazirliyi və Təhsilin İnkişafı Fondunun təşkilatçılığı ilə keçirilən, Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunan Təhsilin İnkişafı Forumunda iştirak ediblər.

"İnnovasiya ekosisteminin yaradılması", "Universitet-sənaye tərəfdaşlığı" və "Gələcək üçün təhsil" panellərində müzakirələrin aparıldığı Forumda peşəkar yerli və beynəlxalq moderator və spikerlərin çıxışları maraqla qarşılanıb.

Panellər zamanı təhsil və iqtisadiyyatın inteqrasiyası, təhsil və əmək bazarı, sənaye ilə tərəfdaşlıq strategiyası, sənayenin təhsildən gözləntiləri, əlavə dəyərin yaradılması, ekosistemin inkişafında bankların rolu, tədqiqat və inkişaf ekosistemi, ömürboyu təhsil, əmək bazarının dəyişən tələbləri, süni intellekt və təhsil mövzularına toxunulub.

"Təhsildən tərəqqiyə" devizi ilə təşkil olunan forumda iştirakçılarla işgüzar əlaqələrin qurulması, birgə layihələrin planlaşdırılması, həmçinin innovasiya ekosisteminin yaradılması, dövlət-özəl tərəfdaşlığı, təhsil və iqtisadiyyatın inteqrasiyası kimi mövzular üzrə müzakirələr aparılıb, iştirakçıları maraqlandıran suallar yerli və beynəlxalq mütəxəssislər tərəfindən cavablandırılıb.

## "Zəfərli yurdum" mövzusunda tədbir



Noyabrın 3-də ADPU-nun Riyaziyyat fakültəsi və Tələbə Həmkarlar İttifaqı Komitəsinin (THİK) təşkilatçılığı ilə Zəfər Gününə həsr olunmuş "Zəfərli yurdum" adlı tədbir keçirilib. Tədbirdə Universitet rəhbərliyi, fakültə dekanları, professor-müəllim heyəti və tələbələr iştirak ediblər. Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlanıb. Vətən uğrunda canlarını fəda edən şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Giriş sözü ilə çıxış edən Riyaziyyat fakültəsinin dekan müavini, dosent Elşad Həmidov 8 Noyabr - Zəfər Gününün müasir tariximizə qızıl hərflərlə yazılmış ən önəmli tarixlərdən biri olduğunu diqqətə çatdırıb. İşğaldan azad olunmuş rayonlar haqqında videoçarx izlənildikdən sonra bədii hissə təqdim olunub. Bədii hissədə Riyaziyyat fakültəsinin IV tədris ili tələbəsi Dilarə Abdullazadə "Xudayar təsnifi"ni ifa edib, müxtəlif rəqs və kompozisiyalar təqdim olunub. Xankəndiyə qayıdışı təcəssüm etdirən yallı rəqsi ilə tədbir başa çatıb.

# Zəfər Günü münasibəti ilə Pedaqoji Universitetdə tədbir keçirilib

Noyabrın 3-də Universitetdə Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının "Ü.Hacıbəyli-68" Ərazi Partiya Təşkilatının (ƏPT) təşkilatçılığı ilə 8 Noyabr - Zəfər Gününə həsr olunmuş tədbir keçirilib. Tədbirdə universitet rəhbərliyi, şəhid valideynləri və qazilər, eləcə də, professor-müəllim heyəti və tələbələr iştirak ediblər. Əvvəlcə, rektor, professor Cəfər Cəfərov Vətən müharibəsi şəhidləri Xudayar Yusifzadənin anası Rədə Qurbanova, Arəstə Baxışovanın anası Məktubə Baxışova və Xocalı soyqırımının canlı şahidi Dürdanə Ağayeva ilə görüşüb, Universitetin foyesində Ümummilli Lider Heydər Əliyevin abidəsi, "Zəfər stendi" və "Zəfər guşəsi" ziyarət olunub. Tədbir Dövlət Himninin səsləndirilməsi və şəhidlərin ruhunun bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayıb. Zəfər Günü ilə bağlı videoçarx nümayiş olunub.

YAP "Ü.Hacıbəyli-68" ƏPT-nin sədri, dosent Sultanəli Qurbanovun giriş sözündən sonra Universitetin rektoru, prof. Cəfər Cəfərov bu gün tariximizin ən möhtəşəm qalibiyyət salnaməsini - Böyük Zəfərimizin üçüncü ilini qeyd etdiyimizi vurğulayıb. Rektor deyib ki, 2022-ci ilin sentyabr döyüşləri və cari ilin 19-20 sentyabr tarixlərində həyata keçirilən lokal antiterror tədbirləri nəticəsində qondarma rejim tamamilə tərksilah edildi və özünü buraxmağa məcbur oldu. Bununla da bir əsrdən artıq davam edən təcavüzə son qoyuldu və Azərbaycan ərazi bütövlüyü ilə yanaşı suverenliyini də tam bərqərar etdi. Bundan sonra artıq ölkəmiz yeni inkişaf mərhələsinə qədəm qoyub. Böyük mübarizələrin itgisiz olmadığını qeyd edən prof. C.Cəfərov Vətən müharibəsində 3 minə yaxın vətən övladının canlarından keçdiyini, şəhidlərimizin arasında Pedaqoji Universitetin 15 tələbə və məzununun da yer aldığını vurğulayıb. Bildirilib ki, onlardan iki nəfəri "Azərbaycan Bayrağı" ordeni ilə təltif edilib. Eyni zamanda, Zəfər salnaməmizin yeganə xanım şəhidi olan Arəstə Baxışova da Pedaqoji Universitetin yetirməsi, ADPK-nın məzunudur.

Şəhidlərimizin xatirələrini əbədiləşdirmək üçün silsilə fəaliyyətlər icra olunduğunu, canlarını vətən yolunda fəda edən vətənpərvər gəncliyi



tərbiyə edən müəllimlərin yetişdirildiyi Pedaqoji Universitetdə də bu istiqamətdə ardıcıl iş aparıldığını diqqətə çatdıran rektor deyib ki, eyni zamanda universitetin 100 illiyində "Pedaqoji Universitetin Qəhrəmanları" ensklopedik toplusu hazırlanaraq nəşr olunub, ADPU-da "Zəfər stendi", "Zəfər qorelyefi" və bu yaxınlarda isə Pedaqoji Universitetin I və II Qarabağ müharibəsində şəhid olan tələbə və məzunlarının adlarının əbədiləşdirildiyi "Zəfər guşəsi"nin açılışı olub. Daha sonra çıxış edənlərdən Vətən müharibəsi şəhidləri Xudayar Yusifzadənin anası Rədə Qurbanova, Arəstə Baxışovanın anası Məktubə Baxışova, Xocalı soyqırımının canlı şahidi Dürdanə Ağayeva, Şəhid Ailələri, Əlillər və Müharibə Veteranlarının Müdafiəsi İctimai Birliyinin sədri, I Qarabağ və Vətən müharibəsi veteranı Tahir Məmmədov, eləcə də digər şəhid ailəsi üzvləri və qazilər göstərilən diqqətə və qayğıya görə minnətdarlıq edərək, canını fəda edən qəhrəmanlarımızın qanının yerdə qalmadığını, torpaqlarımızın işğaldan azad edildiyinin fərəhini yaşadıqlarını qeyd ediblər. Sonda fəal gənclərə partiya biletləri təqdim olunub.

Daha sonra təşəbbüs qrupunun rəhbəri və Assosiasiyanın İdarə Heyətinin sədri Eltac Cəbiyev təşkilatın Əsasnaməsini və İdarə Heyətinə təklif olunan üzvlərin siyahısını iştirakçıların diqqətinə çatdırıb.

Konfrans nümayəndələri Assosiasiyanın təsisi və İdarə Heyətinin üzvlərinin təsdiq olunması, eləcə də, təşkilatın Əsasnaməsinin ADPU-nun Elmi Şurasında təsdiq olunmaq üçün tövsiyə olunması haqqında yekdil qərar qəbul ediblər.

Daha sonra çıxış edən məzunlar da öz təəssüratlarını bölüşüb, Assosiasiyanın təhsil sahəsində faydalı ictimai təşəbbüs kimi müsbət nümunə olacağına əminliklərini ifadə ediblər.

Qeyd edək ki, ADPU GMA-nın İdarə Heyətinin sədri Eltac Cəbiyev, sədr müavinləri Rəşad Nəsibov və Günay Əkbərova, Nəzarət-təftiş Komitəsinin sədri Turan Kərimli, İctimaiyyətlə əlaqələr və marketinq üzrə koordinatoru Cavid Hüseynov, Partnyorlarla iş üzrə koordinatoru Günay Nəzərova, Beynəlxalq əlaqələr üzrə koordinatoru Hakan Köse, Layihələrlə iş üzrə koordinatoru Nigar Xıdırova, Məzunlar və Klublarla iş üzrə koordinatoru Asim İbrahimov, Könülllülərlə iş üzrə koordinator İsmayıl Nəsirovdur. Azərbaycan Gənc Müəllimlər Assosiasiyası ADPU GMA-nın tərəfdaş qurumudur.

# "Heydər Əliyev və hüquqi dövlət" hüquq olimpiadasının qalibləri mükafatlandırıldı



Noyabrın 4-də ADPU-da Azərbaycan Respublikası Konstitusiya Məhkəməsinin Ulu Öndər Heydər Əliyevin 100 illik yubileyi və 12 Noyabr - Konstitusiya Günü münasibəti ilə təşkil etdiyi "Heydər Əliyev və hüquqi dövlət" hüquq olimpiadasının qaliblərinin mükafatlandırılma mərasimi keçirilib. Mükafatlandırılma mərasimində ADPU-nun rəhbərliyi, Konstitusiya Məhkəməsinin nümayəndələri, universitetin struktur rəhbərləri və tələbələr iştirak ediblər. Əvvəlcə, Ümummilli Lider Heydər Əliyevin Universitetin foyesində ucaldılmış abidəsi önünə gül dəstələri qoyulub, "Zəfər guşəsi" və ADPU-nun Heydər Əliyev Muzeyi ziyarət olunub. Dövlət Himninin ifa olunması və Ulu Öndərin və vətən uğrunda canlarından keçən şəhidlərin xatirələrinin yad edilməsi ilə başlayan tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov əsası Heydər Əliyev tərəfindən qoyulan hüquqi dövlət quruculuğu ilə bağlı geniş nitq söyləyib, gənclərin hüquqi dünyagörüşlərinin artırılmasının vacibliyini vurğulayıb. Rektor Konstitusiya Məhkəməsinə belə ictimai faydalı və stimullaşdırıcı təşəbbüs üçün təşəkkürünü bildirərək olimpiada qaliblərini təbrik edib. Çıxış edən Azərbaycan Respublikası Konstitusiya Məhkəməsi Aparatının Konstitusiya hüququ şöbəsinin müdiri, III dərəcəli dövlət qulluğu müşaviri Dürdanə Məmmədova Konstitusiya Məhkəməsinin sədri Fərhad Abdullayevin olimpiada iştirakçılarına müraciətini oxuyub və qeyd edib ki, qurum tərəfindən gənclər arasında konstitusion dəyərlərin təbliği məqsədi ilə ənənəvi olaraq olimpiadalar təşkil olunur, maarifləndirmə işləri aparılır. Daha sonra Universitet üzrə 134 tələbənin qatıldığı olimpiadada yüksək nəticə göstərərək, I yeri tutan Kimya və biologiya fakültəsinin tələbəsi Aysel Firuz qızı Əmirova, II yeri tutan Kimya və biologiya fakültəsinin tələbəsi Həzrə Firuz qızı Əmirova, III yeri tutan Tarix və coğrafiya fakültəsinin tələbəsi Anar Mehman oğlu Əlizadə və fərqlənən 15 nəfər tələbə diplom və hədiyyələrlə təltif edilib. Qeyd edək ki, olimpiadada I və II yeri tutan Kimya və biologiya fakültəsinin tələbələri Aysel və Həzrə eyni ixtisasda təhsil alan bacılardır.

# Pedaqoji Universitetdə Gənc Məzunlar Assosiasiyası təsis edildi




Noyabrın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Gənc Məzunlar Assosiasiyasının (ADPU GMA) təsis konfransı keçirilib. Konfrans iştirakçıları, əvvəlcə, Universitetin foyesində Ümummilli Lider Heydər Əliyevin abidəsini və Pedaqoji Universitetin şəhid tələbə və məzunlarının xatirələrinin anıldığı "Zəfər guşəsi"ni ziyarət ediblər. Tədbirdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, strateji inkişaf məsələləri üzrə prorektor Könül Pirverdiyeva, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli, İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri, mətbuat katibi Cavid Hüseynov, Azərbaycan Gənc Müəllimlər Assosiasiyasının (AGMA) sədri Rüfət Əsədzadə, ADPU Gənc Məzunlar Assosiasiyasının İdarə Heyətinin üzvləri, eləcə də, müxtəlif sahələrdə fəaliyyət göstərən məzunlar, ADPU-nun Strateji İnkişaf Mərkəzinin Elm və Təhsil Nazirliyi ilə birgə icra etdiyi "Məktəb liderliyi" proqramının məzunları və tələbə təşkilatlarının sədrləri, ictimai fəal tələbələr iştirak ediblər.

Açılış nitqi ilə çıxış edən rektor, prof. Cəfər Cəfərov qeyd edib ki, ADPU-nun bir qrup fəal məzunundan ibarət təşəbbüs qrupu tərəfindən yaradılması təklif edilən və Pedaqoji Universitetin dəstək verdiyi Gənc Məzunlar Assosiasiyası ADPU məzunlarının şəbəkələşmiş fəaliyyətini təşkil etməyə, eləcə də, universitetin məzunlarla sistematik əlaqələrinin inkişafına, qarşılıqlı faydalı layihələrin icrasına zəmin yaradacaq, həm məzunların, həm də universitetin fəaliyyətinə əlavə ictimai dəstək mexanizmi formalaşdıracaqdır.

Çıxış edənlərdən prorektor, prof. Fikrət Rzayev, prorektor Könül Pirverdiyeva, AGMA-nın sədri Rüfət Əsədzadə də öz növbələrində dünya praktikasında mövcud olan bu təcrübənin ölkəmizin ən köklü ali təhsil ocaqlarından biri olan Pedaqoji Universitetdə tətbiq olunmasının əhəmiyyətini xüsusi vurğulayaraq Assosiasiyanın işinə uğurlar arzulayıblar.

# "Vətən mənim səsimdir" adlı tədbir keçirilib



ADPU-da Tarix və coğrafiya fakültəsinin təşkilatçılığı ilə Universitetin Heydər Əliyev Mərkəzində Zəfər Gününə həsr olunmuş "Vətən mənim səsimdir" adlı tədbir keçirilib.

Tədbirdə şəhid ailələri, qazilər, fakültə rəhbərliyi, professor-müəllim heyəti və tələbələr iştirak ediblər. Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlayan tədbirdə Ulu Öndər Heydər Əliyevin və vətən uğrunda canlarından keçmiş qəhrəman şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad olunub.

Açılış nitqi ilə çıxış edən ADPU-nun Heydər Əliyev Mərkəzinin müdiri Tahir Süleymanov 44 günlük Vətən müharibəsində qazanılmış möhtəşəm Zəfəri şərtləndirən amillərdən söz açaraq tədbirin gedişinə uğurlar arzu edib. Ardınca Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedrasının müəllimi, layihə rəhbəri, t.ü.f.d. Sevil Bəhramova tədbir haqqında iştirakçıları məlumatlandırıb. Fakültənin V tədris ilinin tələbəsi Anar Qarayev isə təqdimat nümayiş etdirib.

Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedrasının professoru Mübariz Əmirov, fakültənin dekan müavini Paşa Quluzadə, Kimya və biologiya fakültəsinin baş müəllimi Rumiyə Camalova və Tariximizə Sahib Çıxaq İB-nin sədri, "Zəfərə gedən yol" kitabının müəllifi Araz Şamil çıxış edərək tədbirlə bağlı öz təəssüratlarını bölüşüblər.

Tədbirin gedişində tələbələrin təşəbbüsləri ilə ərsəyə gətirilən videoçarxlar, 44 günlük Vətən müharibəsi ilə əlaqədar yerli və xarici mediada yayımlanan xəbərlərin gənc tələbələrin dilindən səsləndirilməsini özündə əks etdirən görüntülər nümayiş etdirilib, xor musiqiləri, şeirlər və istiqlal şairi Əhməd Cavadın sözlərinə yazılmış "Çırpınırdı Qara dəniz" mahnısı səsləndirilib.

## "Vətən müharibəsi" stendinin açılışı



İbtidai təhsil fakültəsində Vətən müharibəsi şəhidlərinin xatirəsinə həsr olunmuş stendin açılışı olub. Açılışda Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, ümumi işlər üzrə prorektor Tural Cəlilov, rektorun müşaviri Ümid Mehdiyev, tədris departamentinin direktoru, dosent Sənan Əliyev, İbtidai Təhsil fakültəsinin dekanı, professor Qızxanım Qəhrəmanova, kafedra müdirləri, professor Farrux Rüstəmov və professor Əbülfət Paləngov, dekan müavinləri, müəllim və tələbələr iştirak ediblər.

Əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni ifa olunub, vətən uğrunda canlarını fəda edən şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Stendin açılışı İbtidai təhsil fakültəsinin tələbələrinin təqdim etdiyi vətənpərlik ruhunda kompozisiyaların müşayəti ilə gerçəkləşib. Daha sonra prof. C.Cəfərov tələbələrlə görüşüb. Dərs prosesini izləyən rektor tələbələrin təəssüratlarını dinləyib, onlara təhsil həyatlarında uğurlar arzulayıb.

## Fakültələrdə Zəfər tədbirləri keçirilib



ADPU-nun İncəsənət və fiziki tərbiyə fakültəsində 44 günlük Vətən müharibəsindəki qələbəyə həsr edilmiş "Zəfər guşəsi"nin açılışı olub. Tədbirdə Universitetin rektoru, professor Cəfər Cəfərov, prorektorlar, fakültə dekanları və şöbə müdirləri iştirak ediblər.

Tədbirdə fakültənin I Qarabağ müharibəsində və Vətən müharibəsində iştirak etmiş müəllimləri, eləcə də tədbirdə iştirak edən Vətən müharibəsi qaziləri və şəhid ailəsinin üzvləri rektor tərəfindən fəxri fərmanla təltif ediliblər.

Universitetin Məktəbəqədər təhsil fakültəsində də Vətən müharibəsindəki şanlı Zəfəri qeyd etmək və vətən uğrunda canından keçmiş şəhidləri yad etmək məqsədi ilə tədbir keçirilib. Tədbirdə fakültə dekanı, dosent Nailə Hüseynova, kafedra müdirləri prof. Şəhla Əliyeva, prof. Ramiz Əliyev və prof. Müseyib İlyasovla yanaşı ixtisas kafedraları üzrə TEC sədrləri və fakültənin professor-müəllim heyəti də iştirak edib.

44 günlük müharibənin qəhrəmanlarının xatirəsinin bir dəqiqəlik sükut ilə anılmasıyla başlayan tədbirdə N.Hüseynova çıxış edərək, şəhidlərə Allahdan rəhmət diləyib, Zəfərimizin onların bizə əbədi mirası olduğunu vurğulayıb.

Dekan qeyd edib ki, məhz Azərbaycan xalqının milli qürurunun təntənəsinə çevrilən Ali Baş Komandan, Prezident İlham Əliyevin sərkərdə qətiyyəti və siyasi müdrikliyi sayəsində vətənimizin bütövlüyünə nail olduq.

## Vətən müharibəsi qaziləri ilə görüş

Noyabrın 6-da Azərbaycan Respublikasının Gənclər Fondunun (ARGF) dəstəyi, Böyük Qayıdış Gənclər Təşkilatı İctimai Birliyinin (BQGT İB) və Azərbaycan Dövlət Pedaqoji Universiteti Tələbə Gənclər Təşkilatının (ADPU TGT) birgə təşkilatçılığı ilə Pedaqoji Universitetdə Zəfər Gününə həsr olunmuş görüş keçirilib.

Tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi ilə başlanıb. Vətən uğrunda canlarını fəda edən şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Açılış nitqi ilə çıxış edən ADPU TGT-nin sədri Təhmasib İmaməliyev qalib xalqın vətəndaşları olaraq qürurlu olduğumuzu qeyd edib, canlı şəhidlər olan qazilərimizlə fəxr etdiyimizi vurğulayıb.

BQGT İB-nin sədri Nail Şükürov çıxış edərək bildirdi ki, qazandığımız böyük qələbə, Vətən müharibəsində həyata keçirilən siyasət və bu siyasətin uğuru hər bir gəncin diqqətlə öyrənməli olduğu önəmli məqamlardandır.



Tədbirin gedişində ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində fəaliyyət göstərən Türkoloji Mərkəzin Türk tarixi bölməsinin müdiri, dosent Dayanət Musayev tarix boyu Azərbaycanda, xüsusilə Qarabağ ərazisində baş verən hadisələr və xalqımızın ona qarşı haqsızlıqlarla mübarizəsindən bəhs etdi. BQGT İB-nin İdarə Heyətinin üzvü, Aprel döyüşləri qazisi, Xüsusi Təyinatlı Qüvvələrin ehtiyatda olan baş leytenantı Əhliyat Mehdiyev öz nitqində vurğuladı ki, bizim Qarabağa qayıdışımız milli şüurumuza qayıdışımızdır. O, həmçinin şəhid ailələrinə və övladlarına olan diqqəti, bu istiqamətdə keçirilən ictimai layihələri xüsusi qeyd edib. Aprel döyüşlərinin iştirakçısı, mayor Elşad Təhməzov, Vətən müharibəsi qazisi, kapitan Hüseynalı Hüseynalıyev və Xüsusi Təyinatlı Qüvvələrin zabiti Şəmsəddin Qurbanov da tədbirdə öz təəssüratlarını, Zəfər xatirələrini bölüşdülər, şəhid olan döyüş yoldaşlarını yada saldılar.

## Zəfər tədbiri – "Biz qalibik!"



Noyabrın 7-də Pedaqoji Universitetdə Filologiya fakültəsinin və "Meh" ədəbi dərnəyinin təşkilatçılığı ilə "Biz qalibik!" adlı möhtəşəm tədbir keçirilib.

Zəfər Gününə və "Meh" ədəbi dərnəyinin illik hesabatına həsr olunan tədbirdə Pedaqoji Universitetin rəhbərliyi, Azərbaycanın Milli Qəhrəmanı İbad Hüseynov, şəhid anaları, müharibə veteranları, Qeyri-Hökumət Təşkilatlarının nümayəndələri, eləcə də universitetin professor-müəllim və tələbə heyəti iştirak edib.

Əvvəlcə, ali təhsil ocağının foyesindəki "Zəfər guşəsi" ziyarət edilib, şəhid tələbə və məzunların xatirələri yad edilib. Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi, Ulu Öndər Heydər Əliyevin və şəhidlərimizin əziz xatirələrinin bir dəqiqəlik sükutla yad edilməsindən sonra açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov və beynəlxalq əlaqələr üzrə prorektor, Filologiya fakültəsinin dekanı vəzifəsini icra edən, professor Mahirə Hüseynova qeyd etdilər ki, bu gün Müzəffər Ali Baş Komandan, cənab Prezident İlham Əliyevin rəhbərliyi ilə artıq ərazi bütövlüyü və suverenliyimiz tam bərpa edilib, şəhidlərin qanı bahasına azad edilən doğma torpaqlarımızda Azərbaycan bayrağı qaldırılıb. Artıq Xankəndi şəhərində keçiriləcək möhtəşəm Zəfər paradına saatlar qalır. Daha sonra Azərbaycan Vətən Müharibəsi Veteranları İctimai Birliyinin nümayəndələri tərəfindən prof. C.Cəfərov və prof. Mahirə Hüseynova Birliyin Vətən müharibəsindəki tarixi Zəfərimizə həsr olunmuş "Böyük Zəfər" xatirə medalı ilə təltif ediliblər.

"Meh" ədəbi dərnəyinin üzvlərinin hazırladıqları səhnəciklər, videoçarxlar və vətənpərlik ruhunda şeirlər iştirakçılara duyğulu anlar yaşadıb.

Tanınmış incəsənət nümayəndələrindən Əməkdar artist Elnur Zeynalov, Respublika Muğam Müsabiqəsinin qalibi Almaxanım Əhmədli, Şahin İsmayılov və digərlərinin ifaları tədbirə xüsusi rəng qatıb.

Sonda "Meh" ədəbi birliyinin üzvlərinin Zəfər Günü münasibəti ilə hazırladıqları "Biz qalibik!" fləşmobunun görüntüləri nümayiş olunub, rəqs qrupunun nömrələrinin müşayəti ilə zalda üçrəngli Azərbaycan bayrağı açılıb.

## ADPU IX Bakı Beynəlxalq Kitab Sərgisində təmsil olunub




ADPU-nun Kitabxana-İnformasiya Mərkəzi 11-15 noyabr tarixlərində Bakı Ekspo Mərkəzində keçirilən IX Bakı Beynəlxalq Kitab Sərgisində təmsil olunub.

Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyinə həsr olunan IX Bakı Beynəlxalq Kitab Sərgisində Pedaqoji Universitetin stendində Heydər Əliyevin Azərbaycan təhsil sistemində həyata keçirdiyi elmi-mədəni islahatlardan, milli təhsil quruculuğu sahəsində gördüyü işlərdən bəhs edən, həmçinin həyat və fəaliyyətini əks etdirən nəşrlər, ADPU-nun professor-müəllim heyətinin Ulu Öndər haqqında yazdıqları əsərləri ilə yanaşı universitetin 100 illik yubileyi ilə bağlı nəşr olunmuş silsilə kitablar, monoqrafiya, dərslik, dərs vəsaitləri, tədqiqat əsərləri və universitetin dövri-elmi nəşrləri nümayiş edilib.

Sərgidə ADPU-nun stendi iştirakçılar tərəfindən maraqla qarşılanıb. Respublikanın tanınmış ziyalıları, xarici ölkə nümayəndələri, kitabsevərlər stendlə yaxından tanış olub, onlara universitetin keçdiyi tarixi yol, pedaqoji kadr hazırlığı haqqında, həmçinin Kitabxana-İnformasiya Mərkəzinin təqdim etdiyi elektron xidmətlər barədə geniş məlumat verilib, ziyarətçilərə məlumatverici bukletlər təqdim olunub.

## İctimaiyyətlə əlaqələr və marketinq üzrə təcrübə proqramına start verilib



Noyabrın 13-də Universitetin İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin tərkibində fəaliyyətə başlayan tələbələr üçün təcrübə proqramının açılışı olub.

Tədbirdə şöbənin müdiri, ADPU-nun mətbuat katibi Cavid Hüseynov, redaktor Taleh Mirzəyev, dizayner Elvin Vahidov və "ADPU TV"nin rəhbəri Raman İsmayılov iştirakçılara proqram haqqında ətraflı məlumat verdilər.

Keçirilmiş müsahibələr nəticəsində proqrama müraciət etmiş 200 nəfərdən çox tələbə arasından seçilmiş 50-dək iştirakçı qarşıdakı 6 ay müddətində Pedaqoji Universitetin rəsmi saytı, "Gənc müəllim" qəzeti, sosial media hesabları, "ADPU TV" yutub kanalının işinə cəlb olunacaq, əməkdaşlar tərəfindən təhsil mediası, ictimaiyyətlə əlaqələr və daxil olan sorğuların cavablandırılması, press-relizlərin yazılması, dizayn-montaj işləri, habelə aparıcılıq, müxbirlik və aktyorluq haqqında biliklərini genişləndirəcək, praktik layihələrin icraçılarına çevriləcəklər. Proqramı uğurla tamamlayan iştirakçılara rəsmi sertifikatlar təqdim olunacaq.

## Universitetin bir qrup əməkdaşı Almaniyada işgüzar səfərdə olublar



Pedaqoji Universitetin bir qrup əməkdaşı – tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, ADPU-nun Quba filialının direktoru, dosent Yusif Alıyev, Xarici Dillər Mərkəzinin müdiri, dosent Ülviyyə Hacıyeva, Müasir Azərbaycan dili kafedrasının müdiri, dosent Könül Səmədova, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və Xarici Dillər Mərkəzinin baş müəllimi, filologiya üzrə fəlsəfə doktoru Mirvari Qasımova "Pedaqoji peşəkarlıq və beynəlmiləlləşmə – Postsovet İslam Təhsil Məkanı ilə Dialoq" ("Pedagogical Professionalism and Internationalization – Dialogue with the Post-Soviet Islamic Education Space") layihəsi çərçivəsində 5-11 noyabr tarixlərində Almaniyanın Fridrix-Aleksandr Erlangen-Nürnberq Universitetində (FAU) işgüzar səfərdə olmuşlar.

Səfər zamanı layihənin digər tərəfdaşı olan Qazaxıstanın Qazax Milli Pedaqoji Universitetindən (KazNPU) və Fridrix-Aleksandr Erlangen-Nürnberq Universitetindən (FAU) olan administrativ heyət və əməkdaşlarla beynəlxalq təhsil, təhsildə beynəlmiləlləşmə mövzularında fikir mübadiləsi aparılmış, cari layihənin davam etdirilməsi, həm layihə tərəfdaşı olan universitetlərin öz aralarında, həm də digər tövsiyə oluna biləcək müxtəlif universitetlərlə gələcək əməkdaşlıq imkanları qiymətləndirilmiş, fəaliyyət dayanıqlılığını təmin etmək üçün Cənubi Qafqaz və Mərkəzi Asiya ölkələri üzrə Beynəlxalq Təhsil Şəbəkəsinin (Network on International Education in South Caucasus and Central Asia (NIE-SCCA)) yaradılması barədə razılıq əldə edilmişdir.

Təlim səfəri çərçivəsində Bakı-Nürnberq diasporunun yaradıcısı və eyni zamanda FAU-nun professoru, həmyerlimiz Yaşar Musayevlə görüş keçirilib.

## "Təşkilati idarəetmə və motivasiya" mövzusunda seminar



Noyabrın 15-də Universitetin İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri, mətbuat katibi Cavid Hüseynovun təqdimatında "Təşkilati idarəetmə və motivasiya" mövzusunda seminar keçirilib.

Pedaqoji Universitetdə fəaliyyət göstərən tələbə təşkilatlarının üzvləri üçün keçirilən seminarda funksional idarəetmə, qərar qəbuletmə, təşkilat daxilində münasibətlər, işdə rəsmi üslub və korporativ yanaşma, strateji planlama, zamanın idarə olunması, böhran vəziyyətinin idarə edilməsi, heyətin stimullaşdırılması, işə psixoloji hazırlıq, motivasiya, layihələrin idarə edilməsi, təşkilati mühit və təşkilati davranış, şəbəkələşmə bacarığı və qurumların işində media siyasətinin rolu kimi mövzularda müzakirələr aparılıb, praktik situativ vəziyyətlərin təhlili əsasında idarəetmənin sirlərinə toxunulub. İnteraktiv seminar iştirakçıların sualları ətrafında davam etdirilib.

Seminarda 50-dək fəal tələbə iştirak edib.

## Dövri-elmi jurnalların məhsuldarlıq səviyyələrinin artırılması istiqamətində Əməkdaşlıq Müqaviləsi imzalandı



Noyabrın 14-də ADPU-da "Qlobal əməkdaşlıq və analitik araşdırmalar mərkəzi" İctimai Birliyinin nümayəndələri ilə görüş keçirilib. Görüşdə İSSN Agentliyinin əlaqələndiricisi, "Qlobal əməkdaşlıq və analitik araşdırmalar mərkəzi" İctimai Birliyinin sədri Xəyalə Məmmədova, ADPU-nun rektoru, professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektor, professor Əsəf Zamanov, İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri Cavid Hüseynov iştirak edib. Rektor Cəfər Cəfərov qonağa universitet haqqında geniş məlumat verərək elmi-pedaqoji potensial və prespektivlərdən söz açıb.

Sədr Xəyalə Məmmədova beynəlxalq təcrübənin ölkəmizdə tətbiqi və genişləndirilməsi barədə fikirlərini bildirərək qarşıdakı dövr ərzində ADPU ilə rəqəmsallaşma və dövri-elmi jurnalların saytlarının təkmilləşdirilməsi prosesində geniş əməkdaşlıq prespektivlərini qeyd edib. Çıxış edən prorektor Əsəf Zamanov son illərdə Pedaqoji Universitetdə 6 dövri-elmi jurnalın fəaliyyət göstərdiyini diqqətə çatdırıb. Prorektor bildirib ki, jurnallar əsas elmi nəşrlərin nəticələrinin dərc olunması üçün tövsiyə olunan dövri-elmi nəşrlər sırasına daxildir. Qeyd olunub ki, universitetdə dövri-elmi nəşrlərin fəaliyyətinin daha da təkmilləşdirilməsi üçün rəqəmsallaşmaya ehtiyac var. Daha sonra ADPU-nun dövri-elmi nəşrlərindən "Pedaqoji Universitetin xəbərləri. Riyaziyyat və təbiət elmləri seriyası" və "Pedaqoji Universitetin xəbərləri. Hümanitar, ictimai və pedaqoji-psixoloji elmlər seriyası" dövri-elmi jurnallarına Rəqəmsal Obyekt İdentifikator (DOİ) nömrə təminatı, elmi-tədqiqat, elmi nəşrlərin məhsuldarlıq səviyyələrinin artırılması istiqamətində ikitərəfli əməkdaşlıq müqaviləsi imzalanıb.

## Orta məktəblərdə ingilis dilinin tədrisi üzrə milli strategiyanın yaradılması ilə bağlı görüş



Noyabrın 15-də ADPU-da Şimali Norveç Universitetinin ingilis dili üzrə beynəlxalq mütəxəssisi, professor Simon Borg ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Filologiya fakültəsinin elmi işlər üzrə dekan müavini, filologiya üzrə fəlsəfə doktoru Könül Həsənova, Xarici Dillər Mərkəzinin müdiri, filologiya üzrə fəlsəfə doktoru, dosent Ülviyyə Hacıyeva və əməkdaşları – filologiya üzrə fəlsəfə doktoru Mirvari Qasımova, baş müəllim Günay Alıyeva, baş müəllim Simuzər Muxtarova, Britaniya Şurasının ingilis dili üzrə proqram rəhbəri Könül Əhmədova və Azərbaycan üzrə milli məsləhətçi Aygün Dadaşova iştirak ediblər.

Məlum olduğu kimi, Britaniya Şurası Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin tərəfdaşlığı və Azərbaycan Respublikasının Təhsil İnstitutunun dəstəyi ilə uzun illərdir ki, təhsil sahəsində uğurlu layihələr həyata keçirməkdədir. 2023-2024-cü illər üçün Britaniya Şurasının nəzərdə tutduğu fəaliyyətlərindən biri də Elm və Təhsil Nazirliyi ilə əməkdaşlıq çərçivəsində ölkə üzrə ümumi təhsil müəssisələrində ingilis dili üzrə tədrisin keyfiyyətinin yaxşılaşdırılması ilə bağlı strategiyanın hazırlanmasıdır. Sözügedən strategiyanın hazırlanması üçün Britaniya Şurası tərəfindən beynəlxalq məsləhətçi kimi prof. Simon Borg seçilib. O, əvvəlki illərdə də Azərbaycanda işləmiş və apardığı tədqiqat nəticəsində ərsəyə gələn SPEX proqramı həyata keçirilmişdir.

Prof. Simon Borgla görüşdə ümumi təhsil müəssisələrində ingilis dili üzrə tədrisin keyfiyyətinin yaxşılaşdırılması ilə bağlı milli strategiyanın hazırlanması yönündə müzakirələr aparılmış, ekspert cari təhsil proqramları, tədris planları, sillabuslar, dərsliklər və s. ilə tanış olmuşdur.

## Yeni Azərbaycan Partiyasının 31 illiyi münasibətilə tədbir

Noyabrın 15-də Pedaqoji Universitetdə Yeni Azərbaycan Partiyasının (YAP) fəaliyyətə başlamasının 31 illiyi münasibəti ilə tədbir keçirilib. YAP Səbail rayon təşkilatının "Ü.Hacıbəyli 68" Ərazi Partiya Təşkilatı (ƏPT) tərəfindən keçirilən tədbirdə universitet rəhbərliyi, ictimai-siyasi xadimlər, müəllim və tələbələr iştirak ediblər.

Əvvəlcə, Universitetin foyesində Ümummilli Lider Heydər Əliyevin abidəsi və "Zəfər guşəsi" ziyarət olunub, Ulu Öndərin və şəhidlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib. "Ü.Hacıbəyli 68" ƏPT-nin sədri, dosent Sıtənəli Qurbanovun moderatorluğu ilə davam edən tədbirdə açılış nitqi ilə çıxış edən Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov Yeni Azərbaycan Partiyasının Azərbaycan tarixinin son dərəcə ağır və keşməkeşli günlərində, ölkənin ciddi sınaqlara məruz qaldığı bir dövrdə Azərbaycan ziyalılarının təşəbbüsü və fəal iştirakı ilə yarandığını qeyd edib. Rektor vurğulayıb ki, məhz belə bir zamanda 91 nəfər Azərbaycan ziyalısının imzası ilə Naxçıvana, Heydər Əliyevə müraciət göndərildi və beləliklə, 1992-ci il noyabrın 21-də xalqın müraciətini qəbul edən Heydər Əliyevin sədrliyi ilə Azərbaycanın bütün regionlarından seçilmiş nümayəndələrin təmsil olunduğu təsis konfransı keçirildi.



Tariximizin son 31 ilinin YAP-ın fəaliyyəti ilə üzvi surətdə bağlı olduğunu deyən rektor Azərbaycanın YAP-ın banisi olan Ümummilli Lider Heydər Əliyevin təməlini qoyduğu, Azərbaycan Respublikasının Prezidenti, Partiyanın Sədri cənab İlham Əliyevin davam və inkişaf etdirdiyi inkişaf və tərəqqi strategiyası ilə Böyük Zəfərə nail olduğunu və cənab Prezident tərəfindən cari ilin 15 oktyabrında Xankəndi şəhərinin mərkəzində Azərbaycan bayrağının dalğalandırılması ilə son 30 ildə pozulmuş ərazi bütövlüyümüz və suverenliyimizin tam bərpa edildiyini diqqətə çatdırıb.

Tədbirdə iştirak edən YAP Veteranlar Şurasının sədri Arif Rəhimzadə, AMEA-nın müxbir üzvü, professor Novruz Quliyev, "91"lərin nümayəndələrindən Rizvan Vahabov və ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev qeyd ediblər ki, ölkəmizin bundan sonrakı parlaq və dayanıqlı inkişafı da məhz cənab Prezident İlham Əliyevin uzaqgörən siyasəti, Yeni Azərbaycan Partiyasının məfkurəsi ilə bağlıdır.

Sonda partiya sıralarına yeni daxil olan gənclərə üzvlük vəsiqələri təqdim olunub.

## BDU-nun Ekoloji kimya kafedrasının nümayəndə heyətinin iştirakı ilə seminar




Noyabrın 16-da ADPU-da Ulu Öndər Heydər Əliyevin 100 illik yubileyi ilə əlaqədar Kimya və biologiya fakültəsinin elmi seminarı keçirilib.

Elm və innovasiyalar üzrə prorektor, professor Əsəf Zamanov, Kimya və biologiya fakültəsinin dekanı, dosent Reyhan Ağayeva, İbtidai təhsil fakültəsinin dekanı, professor Qızxanım Qəhrəmanova, Məktəbəqədər təhsil fakültəsinin dekanı, professor Nailə Hüseynovanın və Kimya və biologiya fakültəsinin müəllim və tələbələrinin iştirak etdiyi seminarda Bakı Dövlət Universitetinin (BDU) Ekologiya və torpaqşünaslıq fakültəsinin Ekoloji kimya kafedrasının nümayəndə heyəti qonaq qismində iştirak edib. Elmi seminar Ulu Öndərin elmə qayğısı, eləcə də BDU-nun Ekoloji kimya kafedrasının fəaliyyəti ilə tanışlıq və təcrübə mübadiləsinə həsr olunub.

Seminardan öncə, Pedaqoji Universitetin rektoru, professor Cəfər Cəfərov BDU-nun Ekoloji kimya kafedrasının müdiri, professor Sevinc Hacıyevanın rəhbərlik etdiyi nümayəndə heyətini qəbul edib, Ulu Öndər Heydər Əliyevin Universitetin foyesindəki abidəsi ziyarət olunub.

Ümummilli Lider Heydər Əliyevin və şəhidlərin ruhlarının bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayan seminarda açılış sözü ilə çıxış edən fakültə dekanı, dos. R.Ağayeva qonaqları təqdim edərək, BDU-nun Ekoloji coğrafiya kafedrasının 10-dan çox nümayəndəsinin seminarda iştirak etdiyini diqqətə çatdırıb.

Çıxış edən prof. Sevinc Hacıyeva, əvvəlcə, Ulu Öndər Heydər Əliyev haqqında xatirələrini bölüşüb, daha sonra isə BDU-nun Ekoloji kimya kafedrasının elmi-tədqiqat fəaliyyəti ilə bağlı məruzə edib. Məruzədə qeyd olunub ki, kafedranın təməli 2001-ci ildə mərhum akademik, görkəmli alim Rəfiqə Əliyeva tərəfindən yeni bir elmi istiqamət kimi əsası qoyulan Ekoloji kimya və ətraf mühitin mühafizəsi elmi-tədqiqat laboratoriyasına dayanır. Bildirilib ki, hazırda kafedra əməkdaşları, əsasən, işğaldan azad edilmiş Qarabağ və Şərqi Zəngəzur regionlarında ətraf mühitin vəziyyətinin ekoloji-kimyəvi tədqiqi üzərində çalışırlar. Diqqətə çatdırılıb ki, kafedrada ekoloji kimya üzrə elmlər doktorluğu proqramı üzrə kadr hazırlığı həyata keçirilir. Daha sonra BDU əməkdaşlarından prof. Nərminə Sadıqova, k.e.d., prof. Qiyas Bayramov, k.f.d., dos. Fətəli Hüseynov, dos. Təranə Əliyeva, k/t.f.d. Qismət Xanbabayev, dos. Qoşqar Məmmədov, dos. Tahir İbrahimov və digərləri mövzu ətrafında çıxış edərək, ADPU və BDU-nun müvafiq kafedra və fakültələri arasında elmi-pedaqoji əlaqələrin perspektivlərini qeyd ediblər. Prof. Sevinc Hacıyeva ADPU-nun Kimya və biologiya fakültəsinin nümayəndələrini BDU-ya dəvət edib.

Sonda nümayəndə heyəti tərəfindən ADPU-nun Kitabxana-İnformasiya Mərkəzinə kafedra əməkdaşlarının ərsəyə gətirdiyi elmi əsərlərdən ibarət kitablar hədiyyə edilib, eyni zamanda Kimya və biologiya fakültəsi tərəfindən BDU-nun Ekoloji kimya kafedrasına ADPU-nun 100 illiyi ilə əlaqədar yubiley nəşrləri hədiyyə olunub və qonaqlar universitetin Kitabxana-İnformasiya Mərkəzində yaradılan şəraitlə tanış ediliblər.

## Pedaqoji Universitet rəhbərliyi fəal tələbələrlə görüş keçirib

Noyabrın 16-da Pedaqoji Universitetdə 17 Noyabr – Beynəlxalq Tələbə Günü münasibəti ilə bakalavriat və magistratura səviyyəsində təhsil alan fəal tələbələrlə görüş keçirilib.

Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin təşkilatçılığı ilə baş tutan görüşdə ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli, İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri, mətbuat katibi Cavid Hüseynov, Pedaqoji Universitetin tələbə təşkilatlarının rəhbərləri – ADPU TGT sədri Təhmasib İmaməliyev, ADPU THİK sədrinin birinci müavini Camilə Qurbanova, "Bir Könüllü" Təşkilatının inzibati məsələlər üzrə meneceri, ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin sədri Nərgiz Quluzadə, ADPU Yeni Klubun sədri İsmayıl Nəsirov, "Meh" ədəbi dərnəyinin sədri, "ADPU TV" yutub kanalının rəhbəri Raman İsmayılov, ADPU-nun UNESCO klubunun prezidenti Əhmədağa Babaşov, ADPU-nun Enactus klubunun rəhbəri Şahin Məmmədli, eləcə də, təhsil, ictimai fəaliyyət, idman və incəsənət sahələrində uğurlu gənclər iştirak ediblər.

Görüşdə çıxış edən prorektor Fikrət Rzayev tələbələri təbrik edərək, onlara bundan sonrakı fəaliyyətlərində də uğurlar arzulayıb, Pedaqoji Universitet rəhbərliyinin daim tələbələrin təşəbbüslərini dəstəklədiyini,



onlar üçün müvafiq tədris şəraitinin təmini və innovativ yanaşmaların tətbiqi istiqamətində davamlı fəaliyyət göstərildiyini diqqətə çatdırıb. Təəssüratlarını bölüşən tələbələr də öz növbələrində onları maraqlandıran məsələlər haqqında fikir və təkliflərini səsləndirib, tələbələrlə daimi görüşlərin müsbət bir nümunə olduğunu qeyd ediblər.

## Ürgənc Dövlət Pedaqoji İnstitutu ilə əməkdaşlıq müqaviləsi imzalanıb



Noyabrın 17-də ADPU-da Özbəkistanın Ürgənc Dövlət Pedaqoji İnstitutunun rektoru, pedaqoji elmlər doktoru, dosent Feruza Madrahimova, Pedaqoji fakültənin dekanı, professor Elyor Nabiyev, Özbək, rus dili, ədəbiyyatı kafedrasının müdiri Marquba Matquliyeva, həmçinin baş iqamətgahı Türkiyədə yerləşən Beynəlxalq BZT Akademiyasının təsisçisi və sədri Baha Ahmet Yılmaz, eyni zamanda Akademiyanın Qafqaz və Orta Asiya üzrə rəhbəri, AMEA-nın əməkdaşı Ferahila Şükürova ADPU-nu ziyarət ediblər.

Nümayəndə heyəti ADPU-nun rektoru, professor Cəfər Cəfərov və beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova ilə görüşüblər. Görüşdə, həmçinin Beynəlxalq əlaqələr şöbəsinin baş mütəxəssisi Nurəngiz Mahmudova iştirak edib.

Görüş zamanı ortaq tarixi, dili və dini olan türkdilli dövlətlərin ali məktəbləri arasında əlaqələrin önəmi vurğulanıb. ADPU və Özbəkistan universitetləri arasında mövcud əlaqələrdən danışılıb, elmi əlaqələrin qurulması, akademik heyətin və tələbələrin qarşılıqlı mübadiləsi perspektivləri müzakirə olunub. Görüşdə, həmçinin türkdilli ölkələrin universitetləri arasında şeir müsabiqəsinin təşkili və ADPU ilə Ürgənc İnstitutunun müəllimləri arasında metodika mübadiləsi kimi təkliflər irəli sürülüb.

Görüşün sonunda universitetlər arasında əməkdaşlıq müqaviləsi imzalanıb və tərəflər bir-birinə xatirə hədiyyələri təqdim ediblər.

## Rektor köməkçisi Azərbaycan–Türkiyə Təhsil İşçilərinin II Peşə – Təcrübə Proqramında iştirak edib



"İslahatçı Gənclər" İctimai Birliyi, "Edu Time" Təhsil və İnkişaf Mərkəzi və "Peak Network"un təşkilatçılığı ilə Türkiyənin İstanbul şəhərində Azərbaycan - Türkiyə Təhsil İşçilərinin II Peşə - Təcrübə Proqramı baş tutub. Təcrübə Proqramında digər ali və orta məktəb nümayəndələri ilə yanaşı ADPU-nun rektor köməkçisi Riyad Rüstəmli də iştirak edib.

16-20 noyabr tarixlərində keçirilən proqram Azərbaycan Respublikasının İstanbul şəhərindəki baş konsulluğunu ziyarətlə başlayıb.

Heyəti qəbul edən baş konsul Nərminə Mustafayeva bildirib ki, Azərbaycanla Türkiyə arasında bütün sahələrdə olduğu kimi təhsil sahəsində əməkdaşlıq ən yüksək səviyyədədir.

Proqram çərçivəsində rektor köməkçisi Riyad Rüstəmli Türkiyənin ən nüfuzlu universitetlərindən olan İstanbul Aydın Universiteti, Haliç Universiteti və Üsküdar Universitetini, o cümlədən "Bil Məktəbləri"ni ziyarət edib, İstanbul Aydın Univetsitetinin Qəyyumlar Şurasının sədri Mustafa Aydın, Üsküdar Universitetinin rektoru Nazifə Güngör və Haliç Universitetinin baş katibi Burak Başkan ilə görüşüb. Görüşlərdə qarşılıqlı ikitərəfli əməkdaşlıq da və təcrübə mübadiləsi imkanları müzakirə olunub, perspektivlər qeyd olunub.

## Kazan Federal Universitetinin nümayəndələri ilə görüş keçirilib



Noyabrın 22-də ADPU-da Kazan Federal Universitetinin (KFU) Filologiya və Mədəniyyətlərarası Kommunikasiya İnstitutunun nümayəndə heyəti ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Xarici Dillər Mərkəzinin müdiri, dosent Ülviyyə Hacıyeva, Filologiya fakültəsinin bir qrup əməkdaşı, KFU-nun Filologiya və Mədəniyyətlərarası Kommunikasiya İnstitutunun direktoru, professor Radif Zamaletdinov, beynəlxalq əlaqələr və inkişaf üzrə direktor müavini, professor Elzara Qafiyatova və Kayum Nasiri adına Elmi-Tədris Mərkəzinin direktoru, professor Alfiya Yusupova iştirak ediblər.

Rektor Cəfər Cəfərov qonaqlara universitet haqqında geniş məlumat verərək elmi-pedaqoji potensial və prespektivlərdən söz açıb.

Prof. Radif Zamaletdinov 2010-cu ildə yaradılan Filologiya və Mədəniyyətlərarası Kommunikasiya İnstitutunun KFU-nun aparıcı və ən böyük institutlarından biri olduğunu, filologiya, təhsil, dizayn, incəsənət və mədəniyyətlərarası kommunikasiya sahələrində yüksəkixtisaslı mütəxəssislər hazırladığını qeyd edib. Professor, həmçinin İnstitutda elmi və tədris mərkəzləri, elmi-tədqiqat laboratoriyaları, eləcə də əlavə təhsil mərkəzlərinin fəaliyyət göstərdiyini, onların geniş spektrli əlavə təhsil proqramları təklif etdiyini də əlavə edib.

Görüş zamanı gələcək əməkdaşlıq perspektivləri üçün vacib sahələr müzakirə edilib.

Daha sonra qonaqlar Filologiya fakültəsində 44 günlük şanlı zəfər tariximizə həsr olunmuş "Zəfər stendi"ni, ADPU-nun şəhid tələbə və məzunlarına həsr olunmuş "Zəfər guşəsi"ni ziyarət edib, Filologiya fakültəsinin kafedralarında və Kitabxana-İnformasiya Mərkəzində olublar.

## Şəki filialının tələbələri ADA Universitetində təhsil imkanları ilə tanış olublar



Oktyabrın 17-də ADPU-nun Şəki filialının buraxılış kurslarının tələbələri üçün magistratura təhsili ilə bağlı maarifləndirmə tədbiri keçirilib. Tədbirdə ADA Universitetinin Tələbə qəbulu şöbəsinin nümayəndəsi Mahnur Abbasova, universitetin Təhsil fakültəsinin müəllimi Abbas Abbasov, ADPU-nun Şəki filialının Karyera Mərkəzinin müdiri Xuraman Həmidova, filialın müəllim və tələbələri iştirak ediblər.

Tədbirdə tələbələrə ADA Universitetində magistratura səviyyəsi üzrə müxtəlif istiqamətlərdə təklif olunan proqramlar haqqında məlumat verilərək, bildirilib ki, ötən ildən etibarən bəzi proqramlarda tədris ingilis dili ilə yanaşı, Azərbaycan dilində də təşkil olunur. Magistratura səviyyəsi üzrə ADA Univertsitetindəki imkanlar, xüsusilə də kadr potensialı, xarici mübadilə proqramı vasitəsilə təhsil, karyera imkanları haqqında ətraflı məlumat verilib. Əməkdaşlar tərəfindən ADA Universitetində mövcud olan ixtisaslar, onlara qəbul qaydaları, ixtisasların formatı və təqaüd imkanları vurğulanıb. Sonda tələbələri maraqlandıran suallar cavablandırılıb.

## ADPU-nun əməkdaşları İspaniyada təlimdə iştirak ediblər




13–17 noyabr tarixlərində "Erasmus+" proqramı üzrə həyata keçirilən "Azərbaycan və Rusiya ali təhsil müəssisələrində tədris, təlim və qiymətləndirmə prosesinin daxili keyfiyyət təminatının təkmilləşdirilməsi" (IQAinAR) layihəsi çərçivəsində İspaniyanın Mursiya şəhərində təlimlər təşkil olunub. Təlimlər layihənin tərəfdaşı Mursiya Katolik Universitetinin təşkilatçılığı və ev sahibliyi ilə keçirilib.

Proqram çərçivəsində Azərbaycan universitetlərində də tətbiqi nəzərdə tutulan keyfiyyətə nəzarət siyasəti, institusional səviyyədə həyata keçiriləcək fəaliyyətlər, layihənin qarşısında duran tapşırıqlar müzakirə olunub, keyfiyyət meyarlarının pilot olaraq sınaqdan keçirilməsi tövsiyə edilib.

Açılış mərasimində layihənin koordinatoru olan Niderlandın Vittenborq Tətbiqi Elmlər Universitetinin baş icraçı direktoru Maggie Feng, Mursiya Katolik Universitetinin beynəlxalq əlaqələr üzrə prorektoru Pablo Blesa Aledo və beynəlmiləlləşmə üzrə fakültə koordinatoru, tədqiqatçı və lektor Katrin Schuette salamlama nitqi ilə çıxış edib və layihənin benefisiar universietelərə töhfələri barədə danışıblar.

Təlim səfərində Azərbaycan Respublikasının Təhsildə Keyfiyyət Təminatı Agentliyi, Naxçıvan Dövlət Universiteti, Azərbaycan Texniki Universiteti və Bakı Dövlət Universitetinin nümayəndələri ilə yanaşı Azərbaycan Dövlət Pedaqoji Universitetinin nümayəndə heyəti də – tədris işləri üzrə prorektor Eldar Aslanov, ümumi işlər üzrə prorektor Tural Cəlilov, rektor müşaviri Ümid Mehdiyev, Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərrəmova və Keyfiyyətin təminatı şöbəsinin müdiri Qalib Şərifov iştirak ediblər. Qeyd edək ki, ADPU 2021-ci ildən bu layihədə tərəfdaş qismində iştirak edir və sözügedən görüş IQAinAR layihəsinin ilk idarəedici görüşüdür.

## Quba filialının müəllim və tələbələri şəhid ailəsini ziyarət edib




ADPU-nun Quba filialının kollektivi Quba rayonunun Qımıl kəndindən olan 44 günlük Vətən müharibəsi şəhidi Nuran Akif oğlu Mirzəyevin məzarını və ailəsini ziyarət ediblər. Ziyarətdə fililalın əməkdaşları – direktor müavini, t.ü.f.d. İsmayıl Mahmudov, Riyaziyyat və təbiət elmləri fakültəsinin dekanı vəzifəsini v.i.e. Nübar Bayramova, baş müəllim Rahib Sədullayev, Təcrübə üzrə rəhbər Şəhla İsmayılova, dekanlığın əməkdaşı Nəhayət Şirinova, Tədris şöbəsinin əməkdaşı Fatimə Kiçibəyova və filialın Şəhid Nuran Mirzəyev adına Xarici dil auditoriyasında təhsil alan "Xarici dil müəllimliyi" ixtisasının I tədris ili tələbələri iştirak ediblər. Şəhid valideynləri Akif ata və Təranə ana filial rəhbərliyinə şəhid ailələrinə qarşı göstərdiyi diqqət və qayğıya görə öz minnətdarlıqlarını bildiriblər. Nuran Mirzəyevin məzarını ziyarət etdikdən sonra adına tikilmiş bulağı da ziyarət edən filialın tələbələri orada şeirlər söyləyib, çıxış ediblər.

## Şamaxıda konfrans: Tarix yazan əbədiyaşar lider

Şamaxı Rayon İcra Hakimiyyəti və Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialının birgə təşkilatçılığı ilə Ümummilli Lider Heydər Əliyevin 3 oktyabr 1993-cü ildə keçirilən seçkilərdə müstəqil Azərbaycan Respublikasının Prezidenti seçilməsinin 30-cu ildönümünə həsr olunmuş "Tarix yazan əbədiyaşar lider" mövzusunda elmi-praktik konfrans keçirilib.

Rayon ictimaiyyətinin iştirakı ilə keçirilən tədbirdə Şamaxı Rayon İcra Hakimiyyətinin başçısı Tahir Məmmədov, Yeni Azərbaycan Partiyasının (YAP) qızıl fondu olan "91"lərin və Partiya Veteranlar Şurasının üzvü, siyasi elmlər üzrə fəlsəfə doktoru Tahir Məmmədov, YAP Şamaxı rayon təşkilatının sədri Tural Qasımov və ADPU-nun Şamaxı filailının Sosial və pedaqoji elmlər kafedrasının dosenti Zərifə Cavadova çıxış edərək, müasir Azərbaycan dövlətinin memarı və qurucusu, böyük siyasətçi, Azərbaycan xalqının XX əsrdə yetirdiyi nadir şəxsiyyət, tariximizin canlı əfsanəsi olan Heydər Əliyev haqqında müfəssəl nitq söylədilər.



Qeyd olundu ki, Azərbaycanda bu gün Ulu Öndərimizin ideyaları yaşayır və daha geniş şəkildə həyata keçirilir. Ulu Öndər Heydər Əliyevin uğurlu siyasəti bu gün cənab Prezident İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Nə qədər ki, müstəqil Azərbaycan dövləti var, Azərbaycan xalqı var, Heydər Əliyev ürəklərdə əbədi yaşayacaqdır.

Ardınca filialın tələbələri – Fidan Abbasova və Aydan İbadovanın ifasında Ulu Öndərə həsr olunmuş şeirlər səsləndirildi.

Heydər Əliyevə həsr olunan "Tarix yazan əbədiyaşar şəxsiyyət" filmi nümayiş olundu.

## Şamaxı filialında Türkiyə Cümhuriyyətinin yaranmasının 100 illiyi qeyd olunub



ADPU-nun Şamaxı filialında Sosial və xüsusi fənlər kafedrasının təşkilatçılığı ilə "Türkiyə Cümhuriyyətinin yaranmasının 100 illiyi" mövzusunda elmi seminar keçirilib.

Tədbirdə Azərbaycan Respublikasının və Türkiyə Cümhuriyyətinin Dövlət himnləri səsləndirilib və mövzu ilə bağlı videoçarx nümayiş olunub. Elmi seminarda çıxış edən filialın direktoru, dosent Tünzalə Yusifova bildirib ki, Cümhuriyyətin 100 il öncə elan edilməsi bayram kimi qeyd olunması bütün türk xalqlarının, eləcə də müsəlman Şərqinin çoxəsrlik tarixində dönüş yaratmış mühüm hadisədir. O, Türkiyə Cümhuriyyətinin bir əsrlik dövr ərzində böyük inkişaf yolu qət etdiyini, sosial-iqtisadi və siyasi inkişafa nail olduğunu, modern ordu qurulduğunu, ölkənin regional və beynəlxalq məsələlərdə söz sahibinə çevrildiyini qeyd edib. Vurğulayıb ki, Ulu Öndər Heydər Əliyevin "Bir millət, iki dövlət" şüarı daim öz təsdiqini tapıb, Azərbaycan və Türkiyə qardaş ölkə kimi hər zaman qırılmaz tellərlə bir-birinə bağlı olub.

Sosial və xüsusi fənlər kafedrasının dosenti Zərifə Cavadova "Türkiyə Cümhuriyyətinin yaranması və onun ilk tədbirləri" mövzusunda məruzə ilə çıxış edib. Sonda tələbələrin mövzu ilə bağlı çıxışları dinlənilib, onların ifasında şeirlər və mahnılar səsləndirilib.

## Quba filialının nümayəndə heyəti ADA Universitetində




ADPU-nun Quba filialının direktoru, dosent Yusif Alıyevin rəhbərliyi ilə filialın bir qrup əməkdaş və tələbələrindən ibarət heyət ADA Universitetinə tanışlıq səfəri ediblər. Səfərin əsas məqsədi magistr proqramları və qəbul qaydaları barədə ətraflı məlumat əldə etmək olub. Tələbə-müəllim heyəti üçün ADA Universitetinin müəllimləri Vəfa Yunusova, Aygün Hüseynli və Abbas Abbasov tərəfindən müxtəlif mözvularda təlimlər keçirilib, maraqlı müzakirələr aparılıb.

Görüş zamanı filial nümayəndələri həm də ADA Universitetində tədris olunan ixtisaslar, tələbə-müəllim mühiti, geniş və müasir kitabxana, akt zalı, innovativ tədris auditoriyaları ilə tanış olub, təcrübə mübadiləsi aparıblar. Filialın direktoru dos. Y.Alıyev və əməkdaşlar Quba filialının son 4 ildə qabaqcıl yerli və beynəlxalq təcrübəni öyrənməkdə maraqlı olduğunu diqqətə çatdırıb, bu səbəbdən də görüşə dəvət üçün ADA Universitetinin rəhbərliyinə və təşkilatçılara öz dərin təşəkkürlərini bildiriblər.

## Şəki filialında "Qadın əməyinin təşviqi" mövzusunda mariflǝndirmə tədbiri

Noyabrın 2-də Pedaqoji Universitetin Şəki filialında "Qadın əməyinin təşviqi" mövzusunda maarifləndirmə tədbiri keçirilib. Tədbirdə Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin rəhbər şəxsləri, Dövlət Əmək Müfəttişliyi Xidmətinin Şəki-Zaqatala regional şöbəsinin xidməti ərazisinə aid Şəki, Balakən, Zaqatala, Qax, Oğuz və Qəbələ rayonlarının əsas işəgötürənləri, digər dövlət orqanlarının, ictimai birliklərin, Həmkarlar İttifaqının nümayəndələri və ADPU-nun Şəki filialının kollektivi iştirak ediblər.

Tədbirdə Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyinin Aparatının Əmək siyasəti şöbəsinin sektor müdiri Rəşad Əhmədov, həmin şöbənin əməkdaşı Orxan Nadirov, Şəki-Zaqatala regional Məşğulluq filialının sektor müdiri İlham Mikayılov, 12 nömrəli Yol İstismar MMC-nin Həmkarlar İttifaqı Komitəsinin sədri Əhməd Əhmədov çıxış ediblər.

Çıxışlarda qeyd olunub ki, bu gün Azərbaycan məşğulluq imkanlarının artırılması ilə bərabər, layiqli əməyin təminatı, o cümlədən işçilərin təhlükəsiz və sağlam əmək şəraiti ilə təmin edilməsi istiqamətində fəal dövlət siyasətinə malik ölkələrdən biridir. Son illər əmək münasibətləri sahəsində innovativ həllərin, müasir texnologiyaların geniş tətbiqi əsas pirinsiplərdən birinə çevirilib. Ulu Öndər Heydər Əliyevin Fərmanı ilə yaradılan Dövlət Əmək Müfəttişliyi Xidməti bu gün işçi hüquqlarının etibarlı müdafiəsi ilə yanaşı, işəgötürənlərlə sosial dialoq müstəvisində onlara zəruri metodiki dəstəyi təmin edən bir qurumdur. Qabaqcıl dünya təcrübələrindən irəli gələn risk əsaslı yanaşma modellərinin, ünvanlı, ədalətli və şəffaf nəzarət mexanizimlərinin tətbiqi, layiqli əməyin təminatına, əmək bazarının davamlı inkişafına töhfə vermək qurumun fəaliyyətinin əsas priotitetidir. Çıxış edən natiqlər ölkəmizdə qadınların əmək hüququ məsələsinə toxunaraq bildiriblər ki, Azərbaycan Respublikasının qüvvədə olan qanunvericiliyi üzrə qadınların əmək hüququnun həyata keçirilməsində təminatlar sistemi müəyyən olunub.

## Ağcabədi filialında 9 Noyabr – Dövlət Bayrağı Günü qeyd olunub



ADPU-nun Ağcabədi filialında Dövlət Bayrağı Gününə həsr olunmuş tədbir keçirilib. Tədbir Dövlət Himninin səsləndirilməsi ilə başlayıb. Filialın professor-müəllim heyəti və Pedaqoji fakültənin tələbələrinin iştirak etdiyi tədbiri giriş nitqi ilə açan filialın direktoru, dosent Mobil Məcidov Azərbaycanın müstəqillik rəmzi olan Dövlət Bayrağının yaranma tarixindən danışıb. O, hər birimiz üçün tükənməz qürur mənbəyi olan üçrəngli bayrağımızın ilk dəfə 1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyəti (AXC) dövründə təsis edildiyini diqqətə çatdırıb. Qeyd edilib ki, Ümummilli Lider Heydər Əliyevin təşəbbüsü ilə 1990-cı il noyabrın 17-də Naxçıvan MR Ali Məclisində AXC-nin bayrağı qaldırılıb. Bununla da, üçrəngli bayrağımız həyata yenidən vəsiqə qazanıb. 2009-cu il noyabrın 17-də Prezident İlham Əliyev "Azərbaycan Respublikasının Dövlət Bayrağı Gününün təsis edilməsi haqqında" Sərəncam imzalayıb. Həmin il dekabrın 4-də isə Milli Məclis noyabrın 9-nu Dövlət Bayrağı Günü kimi rəsmiləşdirib. Tədbirdə məruzə edən filialın İctimai, təbiət fənləri və onların tədrisi texnologiyası kafedrasının baş müəllimi, t.ü.f.d. Anar Kərimli milli dövlət atributlarından olan müqəddəs Azərbaycan bayrağının müasir cəmiyyətdə yeri və rolu, onun mənəvi, siyasi-ideoloji əhəmiyyəti və dövlət rəmzlərinin gənc nəslin formalaşdırılmasındakı əhəmiyyətli mövqeyini vurğulayıb. Tədbirin sonunda Bayraq Gününün mahiyyəti, yaranma tarixi və əhəmiyyətini əks etdirən slaydlar nüşayiş etdirilib.

## "Tarixi zəfərimiz Heydər Əliyev siyasətinin təntənəsidir"



Noyabrın 7-də Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illiyi ilə əlaqədar ADPU-nun Şəki filialı və AMEA-nın Şəki Regional Elmi Mərkəzinin (AMEA Şəki REM) birgə təşkilatçılığı ilə "Tarixi zəfərimiz Heydər Əliyev siyasətinin təntənəsidir" adlı tədbir keçirilib.

ADPU-nun Şəki filialının akt zalında keçirilən tədbirdə filialın rəhbərliyi, professor-müəllim, işçi heyəti, AMEA Şəki REM-in rəhbərliyi və kollektivi iştirak ediblər. Əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib, sonra Ümummilli Lider Heydər Əliyevin və Azərbaycanın müstəqilliyi və ərazi bütövlüyü uğrunda şəhid olmuş həmvətənlərimizin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Giriş sözü ilə çıxış edən ADPU-nun Şəki filialının direktoru, r.ü.e.d., dosent Rafiq Rasulov Zəfər Günü münasibətilə tədbir iştirakçılarını təbrik edib, qazanılan böyük qələbənin tarixi köklərindən bəhs edib və bildirib ki, bu zəfər Ümummilli Lider Heydər Əliyev tərəfindən əsası qoyulmuş və möhtərəm Prezident İlham Əliyevin uğurla davam etdirdiyi siyasətin nəticəsidir.

Tədbirdə çıxış edən AMEA Şəki REM-in direktoru, fiz.ü.f.d., dosent Yusif Şükürlü diqqəti böyük Zəfərə gedən yola yönəldərək, Ümummilli Lider Heydər Əliyevin tarixi xidmətlərindən və Prezident İlham Əliyevin həyata keçirdiyi möhtəşəm siyasətdən bəhs edib.

Sonra məruzələr dinlənilib. ADPU-nun Şəki filialının Təbiət fənləri və onların tədrisi texnologiyası kafedrasının müdiri, ped.ü.e.d., professor Firədun İbrahimov "Prezident İlham Əliyevin fəaliyyəti Azərbaycan dövlətçilik tarixinin şanlı səhifəsidir", Humanitar fənlər kafedrasının baş müəllimi Rasimə Bəkirova "İşğaldan azad olunmuş ərazilərdə quruculuq: nəhəng infrastruktur layihələrinin reallaşdırılması", AMEA Şəki REM-in Ekoloji coğrafiya şöbəsinin müdiri Yusif Rəhimov "Ata vəsiyyəti və inamlı zəfər", Ədəbi-mədəni mühit, folklor və etnoqrafiya şöbəsinin kiçik elmi işçisi, Gənc Alim və Mütəxəssislər Şurasının sədri Tural Adışirinov isə "Zəfər Günü bədii ədəbiyyatda" mövzularında məruzələrlə çıxış ediblər.

## Quba filialında şəhid ailələri və qazilərlə görüş keçirilib



ADPU-nun Quba filialının və Şahdağ Milli Parkının birgə təşkilatçılığı ilə filialın Heydər Əliyev Mərkəzində şəhid ailələri və qazilərlə görüş keçirilib.

Tədbirdə filialın struktur rəhbərləri, Şahdağ Milli Parkının müdir müavini Rəvayət Nəzərov, elmi işçisi Şahbala Salmanov, şəhid Yaşar Xudayevin atası Əli Xudayev, şəhid İxtiyar Bayramovun atası Bayram Bayramov, qazilər İsmət Əhmədov, Məhəmməd Əzizov, Mayıl Zahirov və tələbələr iştirak edib.

Çıxış edən şəhid ailələri və qonaqlar filialda Vətən müharibəsi şəhidlərinin xatirəsinin yaşadılması istiqamətində görülən işlərin bir növ mənəvi dəstək olduğunu qeyd edərək belə təşəbbüskarlığa və vətənpərvərliyə görə minnətdarlıqlarını bildiriblər. Qeyd olunub ki, açılan yol, göstərilən nümunə burada yetişdirilən gələcəyin müəllimləri üçün yollarına işıq saçan bir məşəldir.

Sonda xatirə şəkli çəkdirilib, simvolik tort kəsilib, söhbət çay süfrəsi arxasında davam etdirilib.

## "Avropa İİV-ə testləşmə həftəsi" çərçivəsində maarifləndirmə tədbiri




Noyabrın 15-də ADPU-nun Şəki filialında Azərbaycan Respublikası Səhiyyə Nazirliyi Respublika QİÇS-lə Mübarizə Mərkəzinin (RQMM) təşkilatçılığı ilə "Avropa İİV-ə testləşmə həftəsi" çərçivəsində İnsanın İmmun çatışmazlığı Virusunun (İİV) Azərbaycanda yayılmasının qarşısının alınması, İİV/QİÇS barədə biliklərin artırılması, sağlam və təhlükəsiz həyat tərzinin təbliği məqsədi ilə maarifləndirici tədbir keçirilib.

Tədbirdə RQMM-in Şəki regional laboratoriyasının əməkdaşları, ADPU-nun Şəki filialının müəllim və tələbələri iştirak ediblər.

Maarifləndirmə tədbirində təcrübəli həkimlər tərəfindən İİV/QİÇS virusu, Qazanılmış İmmun Çatışmazlığı Sindromunun (QİÇS) yayılma yolları, profilaktikası, müayinəsi və müalicəsi barədə ətraflı məlumat verilib, iştirakçıları maraqlandıran suallar cavablandırılıb.

Tədbir başa çatdıqdan sonra iştirakçılara ödənişsiz və anonim qaydada İİV-ə qarşı ekspress-testdən keçmə imkanı yaradılıb və onlara öz statusları barədə məlumat verilib.

## Regionlarda ali təhsil: reallıqlar və perspektivlər



17-18 noyabr tarixlərində ADPU-nun Quba filialında Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illik yubileyinə həsr olunmuş "Regionlarda ali təhsil: reallıqlar və perspektivlər" III Beynəlxalq elmi konfransı keçirilib.

Konfransın açılış mərasimindən əvvəl Quba Rayon İcra Hakimiyyətinin başçısı İlqar Mahmudov, filialın direktoru, dosent Yusif Alıyev, Quba rayon prokuroru Namiq Muradov, Dövlət Təhlükəsizliyi Xidmətinin (DTX) Quba rayon şöbəsinin rəisi Elcan Süleymanov və ADPU nümayəndə heyətinin üzvləri-professor Müseyib İlyasov və professor Fərrux Rüstəmov Ümummilli Lider Heydər Əliyevin Quba şəhərində yerləşən abidəsini ziyarət ediblər.

Konfrans Azərbaycan Respublikasının Dövlət Himninin səsləndirilməsi, Ulu Öndər Heydər Əliyevin və şəhidlərin əziz xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə öz işinə başlayıb.

Açılış nitqi ilə çıxış edən filialın direktoru, dos. Y.Alıyev qeyd edib ki, Ümummilli Lider Heydər Əliyevin anadan olmasının 100 illik yubileyinə həsr olunmuş Beynəlxalq elmi konfransın əsas məqsədi regionlarda təhsilin və alimlərin elmi-tədqiqatçılıq bacarıqlarının inkişafı, qabaqcıl təcrübənin öyrənilməsi, kadr potensialının yüksəldilməsi, qarşılıqlı elmi və beynəlxalq əlaqələrin qurulması, innovasiyanın gücləndirilməsi, təbii-coğrafi şəraitin potensialının istehsalata və praktikaya cəlb edilməsi, habelə alimləri, tədqiqatçıları, dövlət və özəl sektor təmsilçilərini bir araya gətirməkdir. Bildirilib ki, 5 fərqli ölkənin (Azərbaycan, Türkiyə, Rusiya, Şimali Kipr, Moldova) 9 universitetinin (Azərbaycan Dövlət Pedaqoji Universiteti, Naxçıvan Dövlət Universiteti, Elm və Təhsil Nazirliyinin (ETN) Coğrafiya İnstitutu, Qars Qafqaz Universiteti, Kiriniya Amerikan Universiteti, Dağıstan Dövlət Texniki Universiteti, Həştərxan Dövlət Universiteti, Kişinyov Dövlət Pedaqoji Universiteti və Mərsin Arxeoloji Müzeyi) dəstəyi ilə təşkil olunan Beynəlxalq konfransın Təşkilat Komitəsinə 104 məqalə təqdim olunmuş, onlardan 82 məqalə məruzə üçün qəbul edilmişdir.

Daha sonra çıxış edən Quba RİH başçısının sosial və humanitar məsələlər üzrə müavini Səidə Abasova regionlarda ali təhsilin inkişafının vacibliyini diqqətə çatdıraraq, bu sahədə ADPU-nun Quba filialının örnəyinin təqdirəlayiq hal olduğunu bildirib.

Tərəfdaş universitetlərdən Qars Qafqaz Universitetinin rektor köməkçisi Engin Qılınc təmsil etdiyi ali təhsil ocağının Türkiyədə region universiteti olmasına baxmayaraq, dünyanın nüfuzlu universitetləri sırasında yer aldığını, bu sahədə Azərbaycan universitetləri ilə, xüsusilə də, region ali məktəbi olan ADPU-nun Quba filialı ilə əməkdaşlığından məmnunluğunu bildirib.

Çıxış edən Naxçıvan Dövlət Universitetinin (NDU) rektoru, dos. Elbrus İsayev qeyd edib ki, vaxtilə ADPU-nun filialı kimi fəaliyyətə başlayan NDU hazırda dünyanın ən aparıcı universitetlərinin reytinq sıralamalarında yer alır.

Daha sonra çıxış edən Kiriniya Amerikan Universiteti, ETN-in Coğrafiya İnstitutu, Dağıstan Dövlət Texniki Universiteti, Həştərxan Dövlət Universiteti, Kişinyov Dövlət Pedaqoji Universiteti, Mərsin Arxeoloji Müzeyi və Pəncab Universitetinin nümayəndələri də konfransın ölkələrin qarşılıqlı əməkdaşlığı baxımından əhəmiyyətini diqqətə çatdırıb və qeyd ediblər ki, dünya üzrə artan rəqabətə davam gətirə bilmək üçün ali təhsil ocaqlarında XXI əsrin tələblərinə uyğun təhsil modelinin qurulması vacibdir.

Yekunda Quba Uşaq Musiqi məktəbinin kollektivinin və filialın tələbələrinin ifasında bir-birindən maraqlı bədii səhnəciklər, musiqi nömrələri təqdim olunub.

Açılış mərasimindən sonra iki gün ərzində əyani və onlayn formada panel müzakirələri təşkil olunub, məruzələr dinlənilib.

## Quba filialının müəlliminin məqalələri İngiltərə və ABŞ-də dərc edilib




Pedaqoji Universitetin Quba filialının Ədəbiyyat və dillər kafedrasının müəllimi Sərxan Cəfərovun "The role of Stem education in preparing students for the workforce" ("Şagirdlərin əmək fəaliyyətinə hazırlanmasında STEM təhsilinin rolu") mövzusunda məqaləsi "Web of Science" və "Scopus" elmmetrik bazalarında indekslənən, 2.0 impakt faktor göstəricili və Q2 kateqoriyalı Avropanın (İngiltərə, London) məşhur "Migration Letters" jurnalında nəşr olunub. (https://migrationletters.com/index.php/ml/article/view/3495).

Müəllif bildirir ki, məqalə Ölkə təhsilindəki islahat və yeniliklərin elmi tədqiqata cəlb olunması və təhlilinin aparılması işinə dəstək vermək məqsədi ilə Azərbaycanda STEAM təhsili haqqında araşdırmalara stimul vermək üçün işlənilib.

Müəllifin növbəti məqaləsi isə ABŞ-nin Florida ştatında nəşr olunan "Scopus" indeksli, Q2 kvartilli "Hüquq və davamlı inkişaf" jurnalında dərc olunub.

"Education Policy of 3rd Generation Universities" ("3-cü nəsil universitetlərinin təhsil siyasəti") adlı məqalədə universitetlərin tarixən keçdiyi inkişaf yoluna qısa nəzər salınaraq yeni nəsil universitetlərin qarşısında duran əsas hədəflər (o cümlədən Azərbaycan təcrübəsində) təhlil edilmiş, həmçinin indiki və gələcəyin universitetlərinin beş modeli təqdim olunmuşdur.

Məqalədə qeyd olunur ki, inkişafın müasir anatomiyası hər bir cəmiyyətin tərəqqisi, rifah halı, rəqabətlilik immuniteti, eləcə də, həmin sosiumun biliklər iqtisadiyyatına verə bildiyi töhfə, yeni texnologiyalara sahiblənmə əmsalı ilə bağlıdır. Zamanın çağırışı budur ki, müasir dövrdə keyfiyyətli insan gücü yetişdirən, elmi araşdırma fəaliyyəti yürüdən və toplumun əsas inkişaf alqoritmlərini ifadə edən başlıca təsisatlar universitetlərdir. Son 20-30 il ərzində dünyanın inkişaf etmiş ölkələri yeni nəsil universitetlərinə (3.0 konsepti) transformasiya islahatları aparıb. Bir tərəfdən toplumun ali təhsil qarşısında artan və çeşidlənən tələblərinə cavab vermək, digər tərəfdən qloballaşmanın fürsət və təhdidlərini qarşılamaq bu islahatların əsas fəlsəfi mahiyyətini təşkil edib.

Məqalənin tam variantı ilə **https://ojs.journalsdg.org/jlss/article/view/1670/840 keçidi vasitəsi ilə tanış olmaq olar.**

# Müəllimlik peşəsini seçən üç bacı

Oktyabrın 19-da ADPU-nun rektoru, professor Cəfər Cəfərov ADPU-nu seçən bir ailənin üç qız övladı - Sevil, Sevda və Nisə bacıları ilə görüş keçirib. Görüşdə rektor, prof. Cəfər Cəfərovla yanaşı, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin müdiri Cavid Hüseynov iştirak edib.

Şərəfli və məsuliyyətli müəllimlik peşəsini seçən bacıları təbrik edən rektor onların seçiminin olduqca təqdirəlayiq olduğunu diqqətə çatdırıb və bunu müəllimlik peşəsinin artan nüfuzunun göstəricisi kimi qiymətləndirib.

Təəssüratlarını bölüşən gənclər də ən vacib və böyük məsuliyyət tələb edən peşələrdən olan müəllimlik ixtisasını məhz müəllimlik məbədi olan ADPU-da dərindən mənimsədiklərini bildiriblər. Onlar gələcəyin sağlam gənclərini yetişdirmək üçün müəllimlik ixtisaslarını seçdiklərini vurğulayıblar.

Bacılar həm də aktiv ictimai fəaliyyətlə də məşğul olurlar. Səmimi söhbət şəraitində keçən görüşün sonunda rektor müəllim bacılara xatirə hədiyyələri verib, onlara gələcək fəaliyyətlərində uğurlar arzulayıb.

Qeyd edək ki, Xaçmaz şəhərindən olan Qafarovlar ailəsinin üç qız, bir oğul övladları var. Bacıların üçü də hazırda Pedaqoji Universitetdə müəllimlik peşəsinin sirlərinə yiyələnirlər.

Böyük bacı olan Qafarova Sevil Süleyman qızı ADPU-nun Kimya və biologiya fakültəsinin "Kimya və biologiya müəllimliyi" ixtisasının V tədris ilində, digər bacısı Qafarova Sevda Süleyman qızı Tarix və coğrafiya fakültəsinin "Coğrafiya müəllimliyi" ixtisasının II tədris ilində, kiçik bacıları Qafarova Nisə Süleyman qızı isə Riyaziyyat fakültəsinin "İnformatika müəllimliyi" ixtisasının I tədris ilində təhsil alır. Qardaşları Sənan isə bacılarının da təhsil aldıqları Xaçmaz şəhər Zərifə Əliyeva adına 8 nömrəli məktəb-liseyin X sinfində təhsil alır.

Gənclərin ataları hərbçi, anaları isə evdar qadındır.



## SABAH qruplarının tələbələri Beynəlxalq Astronavtika Konqresində məqalə ilə çıxış ediblər

2-6 oktyabr tarixlərində Azərbaycanda 74-cü Benalxalq Astronavtika Konqresi təşkil edildi. 50 ildən sonra ölkəmizdə baş tutan bu mötəbər konqresdə ADPU-nun SABAH qruplarının tələbələri də iştirak edib.

"Riyaziyyat və informotika müəllimliyi" ixtisasının V kurs tələbəsi Gülnar Qasımzadə və bu ilin məzunları Mətanət Əhmədova, Fəridə Qasımova "GalaXy 101" və "The sicience of Astronomy" adlı 2 məqalə ilə beynəlxalq tələbə zonası və interaktiv zonasında təqdimat ediblər. IV kurs tələbələri Tünzalə Məmmədova və Rəvan Hacıyev isə "The role of Mathematics in Astronomy"adlı məqalələri ilə interaktiv zonada turistlər və konqres iştirakçıları qarşısında öz təqdimat ediblər.




## "Heydər Əliyev dərsləri" davam edir



Oktyabr 16-da ADPU-da yeni tədris ilində "Heydər Əliyev dərsləri"nin ilk məşğələsi keçirilib. Universitetin Heydər Əliyev Mərkəzində baş tutan tədbirdə Tarix və coğrafiya fakültəsinin birinci tədris ilinin tələbələri iştirak edib.

Mərkəzin mütəxəssisi Tərlan Ağayev tələbələri Mərkəzin salonunda nümayiş olunan eksponatlarla tanış edərək qeyd edib ki, burada Ulu Öndərlə bağlı 400-dək foto, arxiv sənədinin surəti, kitab, jurnal, məcmuə və digər əşyalar qorunub saxlanılır. Daha sonra o, dərsin iştirakçılarına Heydər Əliyevin həyatının müxtəlif dövrləri, çoxşaxəli fəaliyyətinin ayrı-ayrı aspektləri barədə məlumat verib.

"Azərbaycan tarixinin Heydər Əliyev mərhələsi" mövzusunda mühazirə ilə çıxış edən mərkəzin müdiri Tahir Süleymanov Ümummilli Liderin şəxsiyyəti, fəaliyyəti, ölkə və xalq qarşısındakı xidmətləri haqqında danışıb, 1969-2003-cü illər arasındakı 34 illik böyük bir zaman kəsiyinin haqlı olaraq "Heydər Əliyev dövrü" adlandırıldığını qeyd edib.

Mühazirədən sonra dünyanın tanınmış dövlət rəhbərlərinin, görkəmli politoloq və yazıçıların Ulu Öndər haqqında söylədiyi fikirləri əks etdirən slaydlar nümayiş etdirilib. Daha sonra dərsin iştirakçıları Heydər Əliyevə həsr olunmuş sənədli filmə tamaşa ediblər.

Sonra məşğələ sual-cavab formasında davam edib, Ümummilli Liderin həyat və fəaliyyətinin müxtəlif aspektləri ilə bağlı məsələlər ətrafında fikir mübadiləsi və müzakirələr aparılıb.

Xatırladaq ki, "Heydər Əliyev İli" çərçivəsində ADPU-nun Heydər Əliyev Mərkəzi tərəfindən ilin əvvəlindən start verilən "Heydər Əliyev dərsləri" ilin sonunadək həm Tarix və coğrafiya fakültəsində, həm də universitetin digər fakültələrində mütəmadi olaraq davam etdiriləcəkdir.

## "Təhsildə icmaçı genderlər" mövzusunda təlim

ADPU-nun SABAH qruplarının təşkilatçılığı ilə "Təhsildə icmaçı genderlər" mövzusunda təlim keçirilib.

Təlimdə gənclərlə "İcma nədir", "Emosional mühitin labüdlüyü" və "Bulinq və onun qarşısının alınması" mövzularında müzakirələr aparılıb. İnteraktiv təlim zamanı tələbələr layihələr hazırlayaraq təqdimatlar ediblər.



## SABAH qruplarının tələbəsi Rebuild Karabakh 2023 sərgisində startapla iştirak edib

ADPU-nun SABAH qruplarının "Riyaziyyat və informatika müəllimliyi" ixtisası üzrə V tədris ili tələbəsi Elmira Poladova fəaliyyət göstərdiyi startap komandası ilə birgə yerli istehsal olan ağıllı bağ və təsərrüfat suvarma sistemi startapı ilə KOBİA daxilində 19-21 oktyabr tarixlərində keçirilən III Azərbaycan Beynəlxalq Qarabağın Bərpa, Yenidənqurma və İnkişafı Sərgisində (Rebuild Karabakh 2023) iştirak edib.



# Tələbələrimiz asudə vaxtlarını səmərəli keçirirlər

**Nəriman Nərimanovun və Səməd Vurğunun ev muzeyinə ekskursiya**



ADPU TGT nəzdində fəaliyyət göstərən ART klubun təşkilatçılığı ilə Nəriman Nərimanovun və Səməd Vurğunun ev muzeylərinə ekskursiyalar təşkil olunub.

Ekskursiyalarda Nəriman Nərimanov və Səməd Vurğunun həyat və yaradıcılıqları ilə yaxından tanış olan tələbələr, görkəmli ictimai-siyasi və ədəbi xadimlər haqqında maraqlı faktlar öyrəniblər.

**Ali Məhkəməyə ekskursiya**



Oktyabrın 28-də Azərbaycan Respublikası Ali Məhkəməsində açıq qapı günü keçirilib. Açıq qapı zamanı tələbələr məhkəmənin inzibati binası ilə tanış olub, zəngin kitabxanasını ziyarət ediblər. Mülki hakim İsfəndiyar Şəfiyev məhkəmə prosesləri haqqında geniş məlumat verərək, tələbələrə maraqlı olan sualları cavablandırıb.

Açıq qapı günündə ADPU-nun 30-a yaxın ictimai fəal tələbəsi iştirak edib.

**Tələbələr Siyasi Repressiya Qurbanları Muzeyində**



Oktyabrın 28-də ADPU TGT-nin Tarix və coğrafiya fakültəsi təşkilatının təşkilatçılığı ilə 30 Oktyabr - Ümumdünya Siyasi Repressiya Qurbanlarının Xatirə Günü münasibətilə Siyasi Repressiya Qurbanları Muzeyinə ekskursiya təşkil olunub.

70-dən çox tələbənin qatıldığı ekskursiya zamanı tələbələrə sovet dövründə repressiyalara məruz qalmış görkəmli şəxsiyyətlər haqqında məlumat verilib və repressiya mexanizmləri ətraflı şəkildə izah olunub. Eyni zamanda tələbələr həmin dövrə aid yazılı materiallarla tanış olub, diskussiya aparıblar. Sonda xatirə şəkli çəkilib.

**"Fikir fırtınası" intellektual yarışı**




Oktyabrın 28-də ADPU Təhsil Könüllüləri Tələbə Birliyi(ADPU TK TB) tərəfindən "Fikir fırtınası" adlı intellektual yarış təşkil edilib.

Yarışdan öncə Dövlət Himni səsləndirilib, şəhidlərimizin ruhu bir dəqiqəlik sükutla yad edilib.

Yarışda "Optimistlər", "Sirius", "Shine", "Legion", "DE-Facto", "İnnovasiya", "13" və "Çehracgillər" komandaları iştirak edib.

Gərgin mübarizə şəraitində keçən yarışın qalibi olan "13" komandasının üzvləri sertifikatla təltif edilib.

**ADPU-da tələbələr antinarkotik təbliğatın vacibliyi barədə məlumatlandırılıblar**



Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Dövlət Komissiyasının daimi fəaliyyət göstərən işçi qrupu ilə Azərbaycan Respublikasının Gənclər Fondu arasında imzalanmış Tədbirlər Planına müvafiq olaraq, ADPU TK TB-nin təşkilatçılığı ilə "Narkotiksiz həyat" mövzusunda Pedaqoji Universitetin tələbələri ilə görüş keçirilib.

Tədbirdə Daxili İşlər Nazirliyinin Baş Narkotiklərlə Mübarizə İdarəsinin Təhqiqat qrupunun rəhbəri, Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Dövlət Komissiyasının işçi qrupunun sektor müdiri, Gənclər Fondunun nümayəndəsi çıxış edərək narkotik asılılıq probleminə dair biliklərinin artırılması məqsədilə iştirakçılara narkotik maddələrdən istifadənin risk amilləri, psixoaktiv maddələrin xüsusiyyətləri və onların sağlamlığa zərərli təsiri, narkotik asılılığın formalaşma mərhələləri, antinarkotik təbliğatın vacibliyi, hüquq-mühafizə orqanlarının apardıqları əməliyyat-axtarış tədbirlərinin səmərəliliyindən, 802 - qaynar xəttinin fəaliyyət istiqamətləri barədə geniş məlumat veriblər.

## ADPU tələbəsi Türk dünyası gənclərinin dostluq görüşündə Azərbaycanı təmsil edib



Universitetin tələbəsi "Türkiyə yüzili" proqramı çərçivəsində Türk dünyasından olan gənclərin dostluq görüşündə iştirak edib. ADPU-nun SABAH qruplarının "İbtidai sinif müəllimliyi" ixtisasının IV tədris ili tələbəsi, "Bir Könüllü" Təşkilatının sədr müavini - İnzibati məsələlər üzrə menecer, ADPU Təhsil Könüllüləri Tələbə Birliyinin sədri Nərgiz Quluzadə türk dövlətlərindən olan gənclər arasında Azərbaycanı təmsil edən 4 tələbələrdən biri olub. ADPU, BANM, UNEC və ADA universitetlərinin tələbələrinin iştirak etdiyi tədbirdə tələbələr İstanbul və Ankara şəhərlərində həyata keçirilən proqramlarda iştirak ediblər. Nərgiz qardaş Türkiyənin tarixi və mədəni abidələri ilə tanış olmuş, eləcə də Atatürkün məzarını ziyarət etmişdir.

Proqram çərçivəsində Türkiyə Respublikasının gənclik və idman nazirinin köməkçisi Safa Koçoğlu ilə görüşən N.Quluzadə öz fəaliyyəti və həyata keçirilən layihələr barəsində məlumat vermiş, eləcə də Azərbaycan gəncləri adından Nazirliyin "Gənclik" radiosuna öz təəsüratlarını bölüşərək Türkiyə Rspublikasının 100 illiyi münasibətilə bütün türk xalqını təbrik etmişdir.

## Dilqəm Əhmədin seminarı: Azərbaycan bayrağı 105 yaşında



ADPU TGT-nin təşkilatçılığı ilə 17 Noyabr - Milli Dirçəliş Günü münasibəti ilə "Azərbaycan bayrağı 105 yaşında" mövzusunda seminar keçirilib.

Seminarda tanınmış gənc tədqiqatçı və kolleksioner, Dövlət Proqramı çərçivəsində İstanbul Universitetinin doktorantı Dilqəm Əhməd tələbələrə 105 illik tarixi yol keçən üçrəngli bayrağımız haqqında danışaraq, 90-cı illərdə analarımızın tikdiyi bayraqların sovet rejiminə qarşı meydanlarda dalğalandırılaraq müstəqilliyimizi qazandığımızı, nəhayət 30 il sonra isə bu müqəddəs bayrağın Azərbaycan Respublikasının Prezidenti, Müzəffər Ali Baş Komandan İlham Əliyev tərəfindən Xankəndində ucaldılaraq, bütün dünyaya ərazi bütövlüyümüz və suverenliyimizi tam bərpa etdiyimizi nümayiş etdirdiyimizi vurğulayıb.

Mövzu ətrafında çıxış edən ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev Azərbaycan tarixinin öyrənilməsi və tədqiqində Dilqəm Əhməd kimi gənc araşdırmaçıların fəaliyyətlərinin önəmini vurğulayaraq, bu kimi seminarların tələbə-gənclərin inkişafında oynadığı müsbət rolu qeyd edədi.

ADPU TGT-nin sədri Təhmasib İmaməliyev qeyd etdi ki, təşkilat tərəfindən müxtəlif mövzularda, o cümlədən milli-vətənpərlik və dövlətçilik ruhunun inkişafı istiqamətində silsilə tədbirlər keçirilir. O, spikerə Azərbaycan tarixinin populyar dildə təbliği və tədqiqi istiqamətindəki işlərinə görə təşəkkürünü bildirdi. Daha sonra tədbir tələbələrin sualları əsasında interativ formada davam etdirildi.

Yekunda Dilqəm Əhmədin müəllifi olduğu Azərbaycan bayrağının 105 illiyinə həsr olunmuş "Cümhuriyyət bayrağı" kitabı müəllif tərəfindən Pedaqoji Universitetin kitabxanasına və fəal tələbələrə hədiyyə olundu.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ



AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

## KARATE ÜZRƏ DÜNYA ÇEMPİONU OLAN, PEDAQOJİ UNİVERSİTETDƏ TƏHSİLİN SİRLƏRİNİ ÖYRƏNƏN GƏNC QIZ



*Qəhrəmanımız Fatimə Rəfad qızı Cəbrayılova 17 aprel 2005-ci ildə İsmayıllı rayonunda anadan olub. 2022-ci ildə Bakı şəhəri 252 saylı məktəb-liseyin xüsusi sinfindən əla qiymətlərlə məzun olub. Elə həmin il ali məktəblərə qəbul imtahanlarında iştirak edərək Azərbaycan Dövlət Pedaqoji Universitetinin "Məktəbəqədər təhsil" ixtisasına qəbul olunub. Hazırda II tədris ilinin tələbəsidir. 18 yaşlı Fatimə, eyni zamanda karate üzrə həm dünya çempionu, həm də dünya finalçısıdır. 2023-cü ildə Respublika çempionatında ardıcıl olaraq dördüncü dəfə qələbə qazanaraq Özbəkistanın Daşkənd şəhərində keçirilən Gənclər arasında şotokan karate üzrə XIII Dünya çempionatına getməyə haqq qazanıb. Bu çətin yarışda, o, 8 döyüş keçirərək iki müxtəlif kateqoriyada bir qızıl və bir gümüş medal qazanır - gənclər arasında şotokan karate üzrə dünya çempionu və dünya finalçısı adını alır.*

*Fatimə Cəbrayılova hazırda dünya reytinqində öz çəkisində 370 beynəlxalq nəticəli idmançı üzrə 27-ci yerdədir.*

**Xoş gördük! Bizə qısaca Fatimə haqqında məlumat verə bilərsənmi?**

Salam, xoş gördük! Fatimə sosiallığı və əylənməyi sevən, çoxlu məqsədləri olan və böyük uğurlar əldə edəcəyinə inanan gənc qızdır.

**Necə oldu ki, karate ilə məşğul olmağa başladın?**

Balaca olan vaxtlarda hiperaktiv uşaq idim, gecə yaşıdlarımdan gec yatırdım, bacım və qardaşım məndən böyük olduqları üçün işləyirdilər və mən onlara manea olurdum. Onda ailəm belə qərara gəldi ki, idmanla məşğul olum, enerjimi səmərəli istiqamətə yönəldim. Seçimi mənə buraxdılar, mən isə televiziyada gördüyüm MMA (qaydasız döyüş) növü ilə məşğul olmaq istədim. Lakin, maraqlandıqdan sonra məlum oldu ki, bu idman növü çox təhlükəlidir, ona görə də seçimimiz karate oldu. Həmin vaxt cəmi 5 yaşım var idi. İdmana ilk dəfə bacım aparıb məni, həyatda bir çox şeyi ona borcluyam, eləcə də uğurlarımı.

Məşqlərdə bir müddət özünümüdafiə öyrənib dayandıracaqdım, lakin məşqçimiz bacarığımı bəyəndi və məni imtahana çağırdı. İmtahandan keçdim, içimdə karateyə həvəs yarandı və daha sonra bu həvəs heç vaxt qırılmadı.

**İdmanla məktəbdəki dərslərini necə uyğunlaşdırırdın? Bu məsələdə sənə kimlərsə dəstək olurdumu?**

Bu barədə heç kim birbaşa dəstək olmurdu, özüm özümü motivasiya edirdim ki, alınacaq. Anam mənə güvənirdi, güvənin boşa çıxarmaq istəməzdim. Dərs və məşqlər birlikdə mənə çox ağır gəlirdi, yaşıma görə məsuliyyətim çox idi. Gün ərzində səhər məktəbə gedir, günortalar əlavə hazırlıqda olur, axşamlar isə iki məşqdə olurdum, evə də gec saatlarda çatdırdım. Növbəti günün dərslərini hazırlamağı da axşama salırdım. Düzü indi də ağır rejimdi, amma mənim üçün əsas olan nailiyyət qazanmaqdır.

**İlk yarışını, ilk qələbəni xatırlayırsanmı, hansı hissləri keçirmişdin?**

İlk qələbəmi "Caspian Open" turnirində qazanmışam, onda 6 yaşım var idi. İlk çıxışa görə kifayət qədər böyük yarış idi və turnirdə müxtəlif ölkələrin idmançıları iştirak edirdi. Çox həyəcanlı olsam da, inamla mübarizə aparıb nəticədə qalib olmuşdum və həmin an sevincdən ağladığımı xatırlayıram. Həmin gün qardaşım mənə "Sən hər şeyi bacararsan!" demişdi. Hər dəfə zədələnəndə və ya məğlub olanda bu sözü xatırlayıram.

**Ardıcıl olaraq Respublika çempionatlarının qalibi olmağın sirri nədədir?**

İntensiv məşqlər və məqsədyönlülük. Rəqiblərim nə qədər güclü olsa da, həmişə qazanacağıma inanıram. Sözsüz ki, nailiyyətlərimdə şəxsi məşqçim Seymur Xudaverdiyevin rolu daha böyükdür, heç vaxt dəstəyini əsirgəmir. Hər döyüşdən qabaq məşqçimin "tatamidəki qardaşın da olsa, rəqibindir" ifadəsini təkrarlayaraq tatamiyə çıxıram. Bu fikirimi cəmləməyə, məqsədə yönəlməyimə səbəb olur. Eyni zamanda Respublika çempionatlarında qalib gəlmək beynəlxalq turnirlərə vəsiqədir. Bu da hədəfə çatmaq yolunda böyük bir stimuldur.

**Beynəlxalq arenada qazandığın uğurların haqqında danışa bilərsənmi?**

İndiyədək vətənimizə müxtəlif ölkələrdən müxtəlif medallarla gəlmişəm. Hətta deyərdim ki, bir müddət sonra insan bunu missiya hesab edir, medalsız qayıtmaq istəmirsən, özünə sığışdırmırsan. Həm də hər dəfə medalların içinə yenisi əlavə olunanda daha çox həvəslənirsən, xüsusən də xarici ölkələrdən, beynəlxalq yarışlardan olanda. Rusiya, Özbəkistan, Moldova, Ukrayna, Türkiyə, İran, Gürcüstan, Finlandiya, Şimali Kipr, Çexiya və s. kimi müxtəlif ölkələrdə keçirilən yarışlarda, liqalarda və nəhayət Avropa və dünya çempionatlarında iştirak etmişəm. Və Avropa çempionatları istisna olmaqla digər yarışlardan medalla dönmüşəm. İnanıram ki, yaxın zamanda qitə çempionatından da uğurla dönəcəyəm.

**Dünya çempionu adına sahib olduğun sonuncu yarış haqqında nələr deyə bilərsən? Bu yəqin ki, çoxdankı hədəf idi...**

Bu 12 ildir xəyalını qurduğum arzu idi. Sonra məqsəd oldu, sonda isə, nəhayət, nəticə. Qəribə hiss idi, uzaq-yaxın hamı təbrik edirdi, artıq, adi bir idmançı yox, dünya çempionu idim. İnanıram ki, bu uğuru dəfələrlə təkrarlayacağam. Qürurverici hissi yenidən yaşamaq, Azərbaycana qalib kimi dönmək istəyirəm. Yarışdan öncə çox ağır rejimim var idi, işləyirdim, məşq edirdim. Amma bilirdim ki, əziyyətim yerdə qalmayacaq. Elə də oldu. Anamın və məşqçim Seymur müəllimin dəstəyi sayəsində psixoloji olaraq da gücləndim. Medalı alan kimi ilk bacıma zəng elədim, sevincdən ağlayırdı, onda tam olaraq başa düşdüm dünya çempionu olduğumu və özümlə fəxr etdim. Bacım da sanki mənim üzərimmdə olan əziyyətinin qarşılığını almış kimi idi.

**Bundan sonra qarşında hansı hədəflərin var?**

Qarşıda növbəti Respublika çempionatı var və ondan bir gün sonra İtaliyaya səfərimiz baş tutacaq. Premyer Liqada da uğur qazanacağıma inanıram. 2024-cü il isə tamamilə çətin silsilə yarışların olacağı bir ildir. Özümü yaxşı hazırlamalıyam.

**İdman sahəsindəki peşəkar karyeranda sənə uğurlar arzulayırıq, inanırıq ki, daim ölkəmizin adını yüksəklərə qaldıracaqsan. Bəs ali təhsil həyatın haqqında nələr deyə bilərsən? Pedaqoji Universitetdə təhsil almağın hansı üstünlükləri var?**

Pedaqoji Universitet mənim xarakterimə çox müsbət xüsusiyyətlər qatır, dünyagörüşüm, həyati təcrübəm və psixoloji hazırlıq səviyyəmi dərslərdə öyrəndiklərim sayəsində artırıram. Müəllimlərim, xüsusilə, fakültə və kafedraların rəhbərliyi mənə olan inamlarını daim dilə gətirirlər və bu məni həm xoşbəxt edir, həm həvəsləndirir, həm də üzərimdə müsbət məsuliyyət yaradır.

**Təhsil həyatını hansı istiqamətdə davam etdirmək istəyirsən? Karatedəki uğurunu təhsil sahəsində, təhsilin idarəolunmasında təkrarlamaq istəyirsənmi?**

Əslində, təhsilimi təhsilin idarəolunmasında yox, hüquq üzrə davam etdirmək istəyirəm, ölkə xaricində və ya ölkədaxili akademiyalardan birində ikinci bakalavr təhsili almaq istəyirəm. İnanıram ki, bu sahədə də uğurlu olacağam. Hər iki sahədə öz dəst-xətimi yaradacağıma əminəm. Amma hazırkı ixtisasım mənə şəxsi həyatıma, insanlara və balaca idmançılara necə yanaşmalı olduğumu öyrədir, bu çox böyük üstünlükdür.

**Tələbə dostlarına, həmyaşıdlarına bir cümləlik çağırış etmək imkanın olsaydı, bu hansı cümlə olardı?**

Qadınlar zəif deyil, zərifdir, qorxmayın, siz də addım atın. Ümumi olaraq isə "Bəlkə bacaracağam deyərək yox, mən bacaracağam deyərək başlayın!" deyərdim.

**Təşəkkür edirik, uğur daim gəncliyimizlə olsun!**

*Taleh MİRZƏYEV,*
*ADPU-nun İctimaiyyətlə əlaqələr və marketinq şöbəsinin redaktoru*

## BAŞSAĞLIĞI



**Kamil Başirov**
Filologiya fakültəsinin Azərbaycan dili və onun tədrisi texnologiyası kafedrasının professoru



**Dildadə Orucova**
Tədris Departamentinin Planlaşdırma və proqnozlaşdırma şöbəsinin baş mütəxəssisi



**Sahil Abbaslı**
"Tarix müəllimliyi" ixtisasının III tədris ili tələbəsi



**Əzizə Əsgərova**
"Tarix müəllimliyi" ixtisasının I tədris ili tələbəsi

Təəssüf ki, ötən dövr ərzində Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim heyəti, əməkdaşları və tələbələri arasında itkilərimiz olmuşdur. Universitet rəhbərliyi adından dünyasını dəyişən müəllim və əməkdaşımız, eləcə də tələbələrimizin yaxınlarına dərin hüznlə başsağlığı verir, onların vəfatından kədərləndiyimizi bildiririk. Onların xatirəsi qəlbimizdə əbədi yaşayacaq. Allah rəhmət eləsin!



Fotolar Nurlan Səmədovundur. Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı" MMC-də çap olunub. Sifariş №: 3163

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.